ƏMƏQ MƏQTƏBLƏRI UÇUN TƏDRIS
VƏ PEDAGOZI QITABLARЬ

1



KYZIK

# AZƏRBAJCANЬN IKTISADI COGRAFIJASЬ



1930

AZƏRNƏŞR mətbəəsində basьldь.
Baqь, Balşoj Marskoj və Krasno-Presnensqi quçələrin tinində № 16/36.
Baş Mətbuat Mudirliqi 2942
Sifariş 37 Sajь 6800

# AZƏRBAJCANЬN TƏBII-COGRAFIJA ŞƏRTLƏRI

## Bir neçə søz

**Azərbajcan iktisadijjatьnь** tamamilə ihatə edən tədris qitabь nə rysca və nə də turqcə jokdyr, by elmin ajrь-ajrь hissələri ajrь-ajrь qitablar arasьnda dagьlьbdyr və by hissələrin hamьsьnь bir jerə toplaja bilən mutəxəssis qøzləjir.

Bizim by əsrimiz belə bir təşəbbusdur.

Butun azərbajcan iktisadi cografijasь aşagьdaqь hissələrdən ibarətdur:

a) Təbii-cografi şərtlər.
b) Qənt təsərrufatь iktisadi cografijasь.
c) Sənaje iktisadi cografijasь.
ç) Ticarət və jollar iktisadi cografijasь.

Təbii cografi şərtlər Azərbajcan Sosjalist Şyra Cumhyrijjətinin xalk təsərrufatьna tə'sir edən bøjuq faktorlar (amillər) oldyklarь uçun iktisadi cografijaja daxil edilmişdur.

By qunqu Şyra əməq məqtəbi, yşaklarьn øz fəalijjətlərindən oldykca artьk dərəcədə istifadə etməq əsasь uzrə kyrylybdyr.

Jeni tədris metodlarь tədris qitablarь dejil, yşaklarьn øzlərinin dərsin muxtəlif hissələrini təhlil edə bilmələrinə lazьm materjalь verən tədris vəsajiti tələb edir.

Bizim by tədris vəsajitimiz də by əsas uzrə kyrylybdyr.

By vəsajitin çok hissəsini okyjanlarьn øzlərinin aktiv (fəal) syrətdə təhlil edəcəqləri materjal təşqil edir: statistika cədvəlləri, diagramlar, kartogramlar, cografija xəritələrinin kontyrlarь və iləx.

Hadisələrin umym syrətlərinin ajdьn qørunməsinə grafiq metod çok jardьm edir. Bynyn uçun bə'zi statistika materjallarь cədvəllər uzrə dejil, grafiq şəqildə verilmişdur.

Laqin grafiq metod elm olmak uçun o, rijazi dogry olmalьdyr. Bynyn uçun grafiqləri kyrdykda by grafiqlərin rijazi dogry olmalarь uçun lazьm qələn qөstərişlər qөstəriləcəqdur.

Bir şeji tamam və ətraflь bilməq uçun by şeji bila-vasitə muşahədə etməq lazьmdyr. Bynyn uçun by kyrsyn qeçilməsini mutlək istehsalat ekskyrsijalarь və qiçiq bir dajirənin də olmyş olsa təsərrufat həjatьnьn vasitəsiz muşahədəsi ilə yzlaşdьrmak lazьmdyr.

---

# I. AZƏRBAJCANLN TƏBII-ÇOGRAFI ŞƏRTLƏRI

## Dərsin məzmyny

Azərbajcanьn təbii-cografi şərtlərini biz Azərbajcanьn mevkeini, hudydlarьnь, səthini, çajlarьnь, qөllərini, iklimini, topragьnь və bitqilərini өjrənməq mə'nasьnda işlədiriz.

Azərbajcanь by syrətlə өjrənməq uçun Avropa və Asjanьn xəritəsini Azərbajcanьn Xalk Məarif Komisarlьgь tərəfindən nəşr edilmiş təbii-cografija xəritəsini və Azərbajcanьn kontyrly xəritəsini əldə etməq lazьmdyr.

## Dərsə ajid bir neçə izahat

### Açərbajcanьn vəzijjəti

Avropa və asjanьn umym xəritəsində Azərbajcanьn mevkeini tapmak uçun Azərbajcanьn hansь bөjuq sy hevzələri arasьnda oldygyny xəritədə tapmak (Kara dəniz və Kaspi dənizi) və Kara dənizin Azərbajcana dokynmadьgьnь da kejd etməq lazьmdyr.

Sonra xərita uzrə Azərbajcanьn cografi mevkeini tə'jin etməq lazьmdyr. Azərbajcan 38°24′ və 41°56′ şimal eni ilə 62°26′ və 68°17′ (Apşeron jarm adasь janьnda olan 68°2′-li adalarsьz) şərk yzynlygy arasьndadyr.

Okyjanlarьn өzlərinin Azərbajcan xəritəsini çəqmələri çok mənfəəti olar (1-numrəli işə bakьn).

### Azərbajcanьn hudydlarь

Azərbajcan şimalda Dagьstan, cənyb və cənybi-gərbdə Iran, gərbdə Turqijə, Ermənistan və Qurcustan ilə həm hudyddyr.

Turqijə ilə olan hudyd çok bөjuq dejildur. By hudyd 15 qilometro yzynlygyndadyr.

Iran-Azərbajcan hudydy 900 qilometrodan artьk olyb, Karadonly postyna kədər (Zənqəzyrda kьrьlьr) Aras çajь bojy ilə qedir. Byradan 90° çevrilərəq Bilesyvara, Bolgar çajьna dogry jөnəlir. Jenidən 90° dөnərəq hudyd Bolgar çajь bojy ilə jykarьja kalkьr və Karadag dagьna kədər qəlir. Sonra hudyd baş Talьş sьra daglarь və Astara çajь bojy uzrə qedib Kaspi dənizinə enir.

Ermənistan Sosjalist Şyra Cumhyrijjəti Azərbajcanь iqi hissəjə ajьrьr; Naxçьvan өlqəsi və əsil Azərbajcan.

Qurcustan ilə Azərbajcanьn hudydy 300 qilometro kədərdur. Dagьstan ilə olan hudyd 400 qilometroja çatьr. Dagьstanь Şyralar Azərbajcanьndan qeçilməz Baş Kafkaz sьra daglarь ajьrьr.

Şərkdə Azərbajcanь 630 qilometro məsafədə Kaspi dənizi ihatə edir.

### Azərbajcanьn reljefi

Şyralar Azərbajcanь səthinin xusysijjəti byndadyr qi, Azərbajcanda juqsəq daglar və bøjuq jajlalar oldygy qibi, umymi adь Qur-Aras ovasь dejilən qeniş duzluqlər vardyr.

Azərbajcan şakyli istikamətdə dəniz səthindən 24 metro aşagьdan başlajarak (Apşeron jarьm adasьndan Dagьstan hudydyna kədər Kaspi dənizi bojy olan ensiz zolak) 4.400 metroja kədər çatьr (Nyxa və Kyba kəzalarь sərhəddində olan Bazar duzu dagь).

Qur-Aras ovasьnьn səthi 40 min kvadrat qilometrodyr. (By sahə, 86 min kvadrat qilometro mikdarьnda olan butun Azərbajcan sahəsinin 46% təşqil edir).

Juqsəqliqlərə qəldiqdə bynlar şimalda Baş Kafkas daglarь, cənybi-gərbdə qiçiq Kafkas daglarь və cənybi-şərkdə də Talьş daglarь içərisində bylynyrlar.

Taman jarьm adasьnda başlajan bøjuq Kafkas daglarь Azərbajcana cənyb-şərki ycy ilə daxil olyr və kollarь ilə butun Kyba kəzasьnьn və Zakatal, Nyxa, Şamaxь, Baqь kəzalarьnьn da bir hissəsini dytyr.

Şyralar Azərbajcanьnьn ən juqsəq təpələri bøjuq Kafkas daglarь içərisindədur. Jykarьda søjlədiqimiz Bazar duzu, Şahdagь (Kyba kəzasьnda) Babadag, Tyfandag by cumlədəndurlər. (By daglarьn hundurluqunu Şyralar Azərbajcanьnьn təbii-cografija xəritəsindən qøturub øzunuz uçun kejd ediniz).

Azərbajcan daxilində bøjuq Kafkas daglarьndan daha çok jer dytan qiçiq Kafkas daglarь Naxçьvan Sosjalist Şyra Cumhyrijjətini, Myxtar Daglьk Karabag ølqəsini, Qurdustan kəzasьnь və Qəncə Kazax kəzalarьnьn bir çok hissəsini dytyr.

Qiçiq Kafkas daglarь içərisində ən juqsəq təpələr bynlardyr: Kapycyk (4,2 qilometro kədər Naxçivan ilə Zənqəzyr arasьnda). Kamьş (3,7 qilometrodan artьk) və Mirovdag (3,2 qilometrodan bir kədər artьk olyb, Qəncə kəzasьnь Myxtar Daglьk Karabag ølqəsindən ajьran Mirovdag sьrasь uzərindədur).

Qur-Aras ovasь (by ovaja Kaspi bojy duzluqu Şərki-Zakafkasija ovasь da dejilir) aşagьdaqь hissələrə ajrьlьr: **Şirvan çølu** (Qurun sol sahilində), **Mil çølu** (Qur ilə Aras arasьnda), **Mygan çølu** (Qur və Arasьn sag sahilində) və Kьzьl agac qørfəzi janьnda olan **Saljan çølu.**



### Azərbajcanьn sylarь

**Çajlar.** Butun Azərbajcan çajlarь Kaspi dənizi hevzəsinə mənsybdyrlar. Laqin by dənizə təq bir Qur çajь tøqulur.

By hevzədən qənar ancak iqi kəza vardyr. Lənqəran və Kyba kəzalarь.

1113 qilometro yzynlygynda və 910 min kvadrat qilometro kədər bøjuq bir hevzə dytan Qur butun Kafkas daglarьnьn ən bøjuq çajьdyr.

Sabirabad qəndi janьnda Qurə, sag tərəfdən ən bøjuq koly olan Aras çajь tøqulur. Saljan şəhərinin janьnda Qur iqi kola ajrьlьr: sag kol—Akyşy və sol—Baş kol. By kollar da øz nevbələrində bir çok kollara ajrьlьrlar və qeniş delta təşqil edirlər. Deltanьn Kьzьl-agac qørfəzini Kaspi dənizindən ajьran yzyn kymly byrynlarь vardyr.

Qurə sol tərəfdən tøqulən çajlarьn ən əhəmijjətlisi 315 qilometro yzynlygynda olan Alazan (Kanьk) çajьdyr. Alazana 265 qilometro yzynlygynda olan Əjri çajь tøqulur.

Baş Kafkas daglarьndan başlajan bir çok az əhəmijjətli çajlar Qurə dogry akьrlar. Fəkət çatmajarak çøllərdə bataklьklar təşqil edirlər. Tyran çajь, Qøjçaj çajь, Agsy çajь, Pirsaat çajь və diqərləri by çajlardandyrlar.

Qurə sagdan aşagьdaqь çajlar tøqulur; Akstafa çajь, Şamxor çajь, Qəncə çajь, Tərtər (Qurə çatmajьr).

Zakafkasijanьn Qurdən sonra iqinci yzyn çajь olan Aras, Turqijədən başlajьr və Zakafkasja daxilində (başlьca olarak Azərbajcanda) 700 qilometro kədər yzanьr.

Arasa sol tərəfdən qələn kollardan ən əhəmijjətliləri bynlardyr: Gərbi-Avropa çajь, Naxçьvan çajь (koly olan Kars çajь ilə birliqdə) və Bazar çaj.

Kyba və Lənqəran kəzalarь hidrografija cəhətdən tamamilə mustəkil dajirə təşqil edirlər.

Kyba kəzasьnda hamь çajlar Baş Kafkas daglarьndan başlajarak sur'ətlə enir və Kaspi dənizinə tøqulurlər. (Okyjanlara xəritədə by çajlarь tapmak və dəftərlərinə kejd etməq tevsijə olynyr).

Lənqəran kəzasьnda butun sahil „istim" və „morsy" ilə dolydyrlar. Morsylar qølə oxşajьrlar, laqin sahil xətləri çok karьşьkdyr. Kymbaşь və Kala-dag by morsylarьn bøjuqləri cumləsindəndurlər. Istimlər (sy ambarlarь) sun'i syvarma ambarlarьdyrlar. Istimlər ətrafь toprak ilə atьlmьş duz jerlərdur. Byralarda syvarmaja lazьm olan sy toplanьlьr.

**Qøllər.** Şyralar Azərbajcanьnьn qøllərindən Qøj-qølu bilməq lazьmdyr. Qøj-qøl Qəncənin jakьnlьgьnda olyb çok qøzəl bir qøldur. Yzynlygy iqi qilometro jarьma kədər və eni də bir qilometroja kədərdur.

Zakafkasja çajlarьnьn dərələrində bir çok qөllər vardyr. Bynlarьn çoky Qur və Aras deltalarьndadyr. Bynlar çajlarьn qətirdiqləri topraklar ilə ajrьlmьş və kamьş sy sahələridurlər. Sonralar by qөllər bataklьklara dөnurlər.

Bynlardan ən məşhyrlarь Ag-çala, Şin-çala, Əbul-çala və Hacьkabyl çalasьdyr.

## Azərbajcanьn iklimi

Iklimin əsas nişanlarь temperatyr və rutybətdur. Bir iklimin xassələri və karakteri bynlar ilə muəjjən edilir

Iklimə məmləqətin umym reljefi, jerin ycalьgь, dənizin yzak və jakьn olmasь da tə'sir edir.

Azərbajcan şimal mө'tədil mintəkədədur. Azərbajcan by mintəkənin cənyb hissəsinin, şimal eninin 38-42 dərəcələri arasьndytyr. Belə mevke məmləqəti butun il çokly istiliq və ьşьk ilə tə'min edir.

Yzynlykca (Grinviçdən 45 – 50° arasьnda) Azərbajcan Avropa Asjanьn (Avrasijanьn) kara hissəsində okjanoslarьn tə'sirindən yzakda „akarsьz dajirə" dejilən jerdədur. Belə mevke havanьn kyrylygyna, təbəxxurun çoklygyna və məmləqətin sysyzlygyna səbəb olyr.

Ycalьkda Azərbajcan dəniz səthindən 24 metro aşagьdan başlajarak dəniz səthindən 4,400 metro hundurluqə kədər varьr. Hundurluqdə olan by kədər bөjuq fərk, temperatyra bөjuq tə'sir qөstərir. Professor Figyrovsqinin tədkikatьna qөrə Kafkasda orta hesab ilə 100 metro kalkdьkca, temperatyr $^1/_2$° enir. Beləliq ilə Azərbajcanda şakyli istikamət uzrə kalkdьkda Kaspi dənizindən Byzly Şimal dənizinə kədər olan butun istiliq mintəkələrini qeçmiş olyryz [fərk 22°—(4,400m : 100) : 2] olyr. Jagmьrlarьn mikdarь isə jykarь kalkdьkca, havanьn jykarь təbəkələrində temperatyr azaldьgьndan muəjjən hudyda kədər (2000—2100 metroja qibi) artьr. Havanьn daha jykarь təbəkələrindən, temperatyryn azalmasьndan, daglarьn dөşləri ilə kalkan sy byxarlarь daha tez sojyjyr və nəticədə sьkьşarak jagьş və daha jykarьlarda kar şəqlində jerə enir.

Hundurluqun dəniz səthindən artmasilə orta illiq temeratyryn azalmasь və jagmьrьn artmasьna Hərbi-Qurcustan joly bojynda olan jerlər jaxşь misal ola bilər. Dogrydyr by jolyn çok hissəsi Qurcustandan qeçir, laqin Şərki Qurcustanьn iklim şərtləri Azərbajcan ilə yjgyn oldygyndan Qurcustanь Azərbajcana oxşatmak olar.

Kaspi dənizinin Şyralar Azərbajcanьnьn iklimina qөstərdiqi tə'sir nisbətən azdyr. Dar və çok bөjuq olmajan və tamamilə ajrьlmьş sy hevzəsi olan by dəniz-qөl Orta-Asjanьn kyry çөl və



səhralarьndan əsib qələn və jajda isti, kьşda sojyk olan şərk materiq quləqlərini və kyry şimal-şərki quləqlərini artьk dərəcədə jymyşaldа bilməqə imqanь jokdyr.




By quləqlər Kaspi dənizinin uzərindən qeçdiqlərinə bakmajarak Kafkas sahilinə çok az rutybət qətirir. Byнyn uçun by jerlərdə Kara dəniz sahilində ejni endə olan jerlərə nisbətən, jaj daha isti və kьş daha sojykdyr.

Ancak daglarьn Kaspi dənizinə jakьn qəldiqləri jerlərdə (məsələn Talьş daglarь) şərk quləqləri tərəfindən by daglara qətirilən Kaspi byxarlarьnьn çoky sojyjyr və daglarьn ətəqlərinə və Talьş

ovasьna jagьr. By jagmyr Kaspi sahilinin başka jerlərinə nisbətən çok oldygyndan by jerin iklimini rutybətli edir.

Azərbajcan iklimina, Azərbajcanь ihatə edən juqsəq daglarьn bəjuq tə'siri vardyr. Baş Kafkas daglarь kollarь ilə birliqdə kьşda Şimali Kafkasda əsən sojyk şimal-şərki quləqlərdən saklajьr. Bynyn uçun Azərbajcanda by daglarьn cənyb ətəqlərində olan jerlərin kьş və illiq temperatyry by daglarьn şimal ətəqlərində olan jerlərdəqindən jykarьdyr.

Mьtsxet sьra daglarь Zakafkasjanь iqi hissəjə ajьrьr: qərb və şərk hissələri, Azərbajcan şərk hissəsinə daxil olyr.

Qərb tərəfi Kara dənizdən əsən quləqlərin tə'siri altьnda oldygyndan, iklimi daha jymyşak və daha rutybətlidur. By sьra dag şərk tərəfi, Kara dənizdən qələn quləqlərdən sakladьgьndan şərk hissəsinin iklimi daha qəsqin kontinental (kyry) iklimdur. Məsələn; Mьtsxet daglarьnьn sol tərəfində olan Kytajisdə ildə 1374 milimetro jagmьr jagьr. Haman daglarьn şərk tərəfində bylynan Baqьda isə 200 milimetro duşur. Illiq amplityd (ilin ən isti ajь ilə ən sojyk ajьnьn orta temperatyrlarь arasьnda olan fərk) isə Kytajis uçun 18,8°, Baqь uçun 22° dur.

Azərbajcanda istinin jajьlmasьnь tapmak uçun by dərsə ilavə edilən (Figyrovsqinin) „Təbii juqsəqliqdə orta illiq temperatyr xəritəsi" jarar.

By xəritəjə dikkətlə bakdькda Azərbajcanda temperatyryn jajьlmasьna iqi şejin tə'sir etdiqini qəruruz: jerin səthindən juqsəqliqi (Baqь və Zakataladan qeçən izotermalarь dytyşdyryn) və məmləqətin cənyb və ja şimalьnda bylynmasь. Cumhyrijjətimizin muxtəlif hissələrində jagan jagmьrlarьn mikdarь xusysynda, ilavə edilən barabar illiq jagmьr xətləri xəritəsi mə'lymat verir. (Belə xətlərə izogiet dejilir).

By xəritə, jagьşьn ən çoky (jagьş, kar, doly) daglьk və dag ətəqi dajirələrində oldygyny qəstərir (Baqь ilə Zakatalanьn izogietlərini dytyşdyrynyz).

Jagmьrьn ən çok (1400 millimetro) Lənqəran kəzasьnda olmasь nəzəri cəlb edir.

Azərbajcanьn reljefi şimali-qərbdən cənybi-şərkə yzanmьş və agzь dənizə açьlan kyty şəqlindədur. Iklim cihətincə by vəzijjət çok jararlьdyr: butun məmləqət, qunəş və dənizə dogry dyrmyş qərunur və qunəş ilə dənizin nə'mətləri cumhyrijjətin hər bir bycaklarьna jajьlьr. Beləliq ilə Azərbajcana qunəş oldykca yzyn muddət duşur. Məsələn Qəncədə qunəş 2381 saat duşur qi, by da qunəşin ufuk uzərində bylyna bildiqi illiq 4300 (12×365) 54% ni təşqil edir. Apşeron uçun by rəkəm 2342-jə çatьr qi, 4380 saatьn 55%-ni təşqil etmiş olyr.



Azərbajcanьn butun iklimi (Figyrovsqijə qərə) aşagьdaqь beş dajirə və ja mintəkəjə bəlunur:

1) Mərqəzi-çəl kyry sybtropiq dajirə;
2) Bəjuq Kafkasьn mə'tədil isti rutybətli dajirəsi.
3) Qiçiq Kafkasьn mə'tədil sojyk rutybətli dajirəsi.
4) Kyry kontinental Irəvan-Naxçьvan dajirəsi.
5) Sybtropiq rutybətli Lənqəran dajirəsi.

Butun by dajirələrə bakdькda bynlarьn hamьsьnьn, illiq jagmьr mikdarьndan asьlь olarak iqi grypa ajrьldькlarьnь qəruruz: I. gryp jagmьrь ildə 600 milimetro və bir kədər artьk olan rutybətli iklimlər; II. illiq jagmьrlarь 600 milimetrodan az olan kyry iklimlər.

Orta illiq temperatyrdan asьlь olarak hər bir gryp iqi sьnfa ajrьlьr: 1-ci sьnьf—orta illiq temperatyry 15°-dən artьk olan isti iklim, iqinci orta illiq temperatyry 15 dərəcədən aşagь olan sojyk iklim. Beləiq ilə sьnfь tə'jin edən iqi sifətdur: jagmьrьn illiq mikdarь və illiq temperatyr.

Sьnьflar da əz nevbələrində tiplərə bəlunurlər, hər sьnьfda bir neçə (5—6) tip vardyr. Tiplərin sifəti—sьnfьn sifətləridur, ancak byna temperatyryn orta illiq amplitydyny, ən sojyk ajьn orta temperatyryny və isti ajlarьn sajьnь (orta temperatyry 20°-dən jykarь olan) artьrmalьjьz. By sifətlərə səthin sifəti də daxil edilir; dəniz iklimi, dəniz janь iklimi, meşə, çəl, səhra və gejri-iklimlər.

Dytdygy sahənin bəjuqluqunə qərə Azərbajcanьn əsas dajirəsi kyry sybtropiq mərqəzi çəl dajirəsidur. By dajirənin orta illiq temperatyry 15°-dən jykarь, illiq jagmьrь 360 milimetrodan az, amplitydy 26°-dən jykarь beş isti və altь kyraklьk ajlarь vardyr. Ən sojyk ajьnьn orta temperatyry 2°-jə jakьndyr. Ilin ən kyrak vaktь jajdyr. Uç aj jajda cumlətanь 50 milimetroja kədər və çok vakt byndan da az jagmьr jagьr. Ən çok jagmьr jazda olyr.

Dytdygy sahəjə qərə iqinci jeri Bəjuq Kafkasьn mə'tədil-rutybətli dajirəsinə verməq lazьm qəlir. By dajirə jykarьda qəstərdiqimiz dajirədən Azərbajcanьn şimal və şərk hudydlarьna kədər daglьk və dag ətəqi jerləri dytyr. By dajirədə orta illiq temperatyr 15°-dən aşagь, amplityd 24 dən aşagь (22-jə cən və bir kədər daha aşagь) dyr. Isti ajlarьn sajь uçdən artьk dejildur, jagmьrьn mikdarь 600 milimetrodan jykarьdyr, 1000 milimetroja və bir kədər jykarьja da kalkьr. Kyrak ajlarьn sajь 0°-dən 4°-jə qibidur. Ilin ən kyry vaktь kьşdyr. Ən jagьşlь vakt jazьn axьrь və jajьn əvvəlidur. Meşə çokdyr, jykarьlarьnda isə Alp çəmənləri vardyr. Bəjuq Kafkas daglarьnьn dəşu ilə kalkdькda by mə'tədil isti mintəkə, sojyk mintəkə ilə əvəz edilir və daha sonra ən axьrda Alp mintəkəsi qəlir.

• Sahəsinə qörə uçuncu jeri Qiçiq Kafkasьn mө'tədil sojyk və rutybətli dajirəsi dytyr. By dajirə mərqəzi çөl dajirəsindən başlamьş, Azərbajcanьn gərb hudydlarьna kədər Azərbajcanьn butun daglьk və dag ətəqi jerlərini dytyb, gərbə və şimali-gərbə jajьlьr. By dajirədə orta illiq temperatyr 18°-dən aşagьdyr, amplityd 22°-dur, isti ajlar jokdyr. temperatyry 10°-dən jykarь 5 aj vardyr. Jagmьrьn mikdarь 600 dən 800 milimetroja kədərdur. Kyrak ajlar olmajьr. Jagmьrьn ən azь kьşda ən çoky jazьn axьrьnda və jajьn əvvəllərində jagьr. Meşə çokdyr. Jykarьlarьnda isə Alp çəmənləri vardyr.

Dөrduncu dajirə kyry kontinental Erivan-Naxçьvan dajirəsidur. By dajirə Azərbajcan iklimlərinin ən kontinentalьdyr. Orta illiq temperatyr 10-12°-dur, amplityd 30° və jykarьdyr, 4 isti ajlarь vardyr. Jagmьrьn mьkdarь 300 millimetrodən azdyr. 4 və bə'zən də daha artьk kyrak ajlarь vardyr. Jagmьr ən az jajda, ən çok jazda duşur. Jerlərin çoky çөldur.

Beşinci və axьrьncь dajirə sybtropiq rutybətli Lənqəran və ja Talьş dajirəsidur. Iklim rutybətli istidur. Orta illiq temperatyr 15°, amplityd 22-23°-dur. 4 isti ajlarь vardyr. Jagmьr çokdyr, kyrak ajlarь uçdur, cənybda birdur. Jagmьr ən çok kьşda və ən az jajda jagьr. Əl dəjməmiş meşələr, həmişə jaşьl xьrda meşələr və lijanlar vardyr.

## Bitqilər

Azərbajcanьn təbii şərtləri (toprak, iklim, orografiq və diqər təbii cografija şərtləri) çok muxtəlif oldygyndan Azərbajcanьn bitqilər aləmi də çok muxtəlifdur.

Grosshejm Azərbajcan bitqi aləmi uçun jeddi bөjuq gryp qөstərir;

1) meşələr;
2) səhra və jarьm səhralar;
3) şoranlьk bitqilər;
4) meşəsiz daglar formasjasь;
5) sybalpiq və Alp bitqilər;
6) kymlyk bitqilər;
7) sy və şy sevən (hidrofil) bitqilər.

Tədris vesajiti olarak by dərsə ilavə edilən və Grosshejm tərəfindən tərtib edilən, Azərbajcanda bitqilərin jajьlmasь xəritəsindən istifadə etməq olar.

**Meşələr.** Meşələr, Azərbajcanda oldykca çok jer dytyr və Azərbajcanьn butun jarar sahəsinin 13,5% təşqil edir. Muxtəlif kəzalarda meşəliq jerlərin mikdarь muxtəlifdur. Məsələn Lənqəran kəzasьnda 37%, Baqь kəzasьnda 28,5%, Şamaxь kəzasьnda 2,3%, Saljan kazasьnda isə meşə heç jokdyr.



Azərbajcanda nisbətən bөjuq jer dytan dөrt bөjuq meşəliq vardyr. Bynlar Lənqəran, Kyba, Karabag və Zakatal-Nyxa meşəliqləridur. Bynlardan başka çөllər və səhralarda, çaj dərələrində xusysi meşəliq jerlər vardyr. Bynlar tygaj dejilən və Qur ilə kollarь sahilində bitən və indiqi vaktda tamamilə kьrьlmьş meşələrdur.

Azərbajcanda meşələrin 840 min heqtar olan umym sahəsindən 698 min heqtarьnь jə'ni 82,8% daglьk meşələr, 144 min heqtar jə'ni 17,2% duzluq meşələri təşqil edir.

Lənqəran meşəliqləri dəniz sahili duzluqlarından başlajarak, Talьş daglarьnьn dөşu ilə 1,7 qilometro juqsəqliqlərə kədər çatьr. Duzluqlərdə meşələrin çoky kьrьlьb və çəltiq jerləri ilə əvəz edilibdur.

Kyba meşəliqləri Xaçmas və Dərbənd dəmir joly stansijalarь arasьnda olan dəniz sahili duzluqlarından başlajarak, bөjuq-Kafkas daglarьnьn butun şərk yclarьnь өrtur və bə'zi jerlərdə məşələrin bөlunə biləcəqləri ən juqsəq nөktələrə kədər kalkьr.

Karabag meşəliqi Qəncə kazasьnda bөjuq sahə dytarak Qişiq-Kafkas daglarьnьn şimal dөşundə, Qurcustan sərhəddindən cənybda Arasa qibi enli zolak qibi yzanьr. Byndan başka duzluqlərdə Tərtər çajь dajirəsində alçak meşələr vardyr.

Zakatal-Nyxa meşəliqləri bөjuq Kafkas daglarьnьn cənyb dөşunu və by daglarьn ətəqində olan ovanьn bir hissəsini өrtur.

Azərbajcan meşələri bə'zi istisnalardan başka japraklь nev'lərdən ibarətdur (palyt, vələs, fьstьk, agca kajьn, qөruş və gejriləri). Fьstьk ən çok daglarda vələs ilə bir jerdədur. Duzluqlərdə isə palyt, dəmir agacь, vələs, agca kajьn, qөruş və sajirləri çok olyr.

Meşələrdən istifadə etməq işi, məmləqətin iktisadi həjatьnda muhum rol ojnajьr. By qun by meşələr cumhyrijjət topragьndan qeçən dəmir jollarьn (Zakafkasja və Cylfa jollarьnь) ehtijaclarьnь, şpal materjalь ilə tə'min etdiqi qibi, posta telegraf komisarlьgьnьn telefon şalbanlarьna olan ehtijacьnь da tə'min edir. Byndan başka jerli qəntli əhalini janacak və tiqinti materjalь ilə də tə'min edir.

Dag meşəliqlərində lazьmi kədər meşə daşьjan jollar çəqildiqdən sonra, Azərbajcan meşələrindən qeniş syrətdə istifadə etməq və meşə sənajeinin inqişafь (qeniş mə'nada) mumqun olar.

**Səhralar və jarьm səhralar.** Şyralar Azərbajcanьnda səhralar və jarьm səhralar Qur və Aras dajirələrini və nisbətən bir kədər əvvəllər dəniz syjyndan azad olynmyş Kaspi dənizi bojy qedən duzluqləri dytyr.

By axьrьncь faktor və Azərbajcan çөllərinin bir çokynda sy reƶiminin noksanlarь (syvarьlma uçun istifadə edilmiş sylarь toplajan kollektorlarьn olmamasь), topragьn dyzlanmasьna və xusysi dyzlyk bitqilərinin jetişməsinə səbəb olyr. Umymijjətlə şərkdən

gərbə dogry qetdiqcə, səth javaş-javaş da olmyş olsa kalkьr və Azərbajcanьn gərbində olan çəllərin bitqiləri, şərkdə Kaspi dənizinə jakьn olan jerlərdə olan bitqilərdən bir kədər fərklidur.

Gərbdə jerin səthi dəniz səthindən juqsəldiqindən, iklim də bir kədər rutybətli olyr və by rutybət də ez nevbəsində bitqilərin nev'inə tə'sir edir. Byna qerə Azərbajcanda iqi nev' səhra bitqiləri vardyr: şərki səhra bitqiləri və gərb jarьm səhra bitqiləri.

Şərk səhralarьnь Mygan, Saljan, Şirvan və Mil çəlləri təşqil edir. Dyzlanmьş jerləri hələliq qənara kojsak, o vakt bitqiləri jaşьl boz rənqdə olan by çəllərdə joşanь, çəl akasjasьnь, karaçanь, muxtəlif taxьl cinsindən olanlarь və kyrak iklimi sevən bə'z sərt bitqiləri qerəriz.

Gərbi jarьm səhralarьn bitqiləri şərk duzluqlərinin bitqilərindən daha zənqindur. By bir kədər juqsəq dajirəni Sarьca Cejran çəlu, Şirəq və Eldar jarьm səhralarь təşqil edir. By jerlərdə joşan çokdyr. Ən juqsəq jerlərdə təqə sakkalь belə qerunur. By artьk təqə sakkalь çəllərinə bir qeçiddur. Laqin heç jerdə əsil təqə sakkalь çəllər jokdyr, hər jerdə bitqilərin əsasьnь joşan təşqil edir.

**Dyzlyklar** (şoranlar), Cumhyrijjətin çəllərində topragь dyzlanmьş sahələrə çok təsaduf olynyr. Topragьn rutybətinin dərəcəsindən asьlь olarak, kyry, jaş və aradyzlyk tipləri vardyr. Kaspi dənizindən gərbə dogry qetdiqdə, jerin səthi dəniz səthindən juqsəldiqcə, biz jaş dyzlyklar (rutybəti artьk olan) az dyzly çəmənlər və ara tipli dyzlyklar (sy topragьn səthində dajanmajьr, laqin rutybət şərtləri çok juqsəqdur), kyry dyzlykly çəllər və axьrda dyzly topraklь çəllər və jarьm çəllər qeruruz. Dyzlyklarda muxtəlif şoran bitqiləri və bijan qeqlərinə təsaduf olynyr.

**Kyrak sevənlər**. Azərbajcanьn kyrak dajirələrində muəjjən juqsəqliqdə joşan jarьm çəlu kyrtarьr. Bir də joşan jetişməsi uçun bərq toprak və nisbətən dyz az daşlь olan deşlər tələb edir.

Daha daşlь deşlərdə və bir kədər aşagьlarda joşan jarьm çəlu kyrtarьr. Bynyn jerinə meşəsiz daglьklar başlajьr, byralarda kyrak sevən bitqilər vardyr. By jerlərdə ən çok astragallar (qəpənəq çiçəqli qollar) akantalimon – kalьn qejəmlər (yzyn sapalaklь qezəl çiçəqlər), tiqanlь dəvə oty bərq qeqlu və pis kokyly sədəf oty (al boja verir), kan kyrydan (byny ancak dəvə jejir) və gejri otlara təsaduf olynyr.

Azərbajcanda by daglьk kyrak sevən bitqilər dert dajirə təşqil edirlər: 1) Lənqəran kəzasьnda Zyvand dajirəsi (Diabar çeqəqi), 2) Qejçaj kəzasьnda Boz dag sьrasь və jakьnda olan daglar. Şamaxь dag ətəqləri də Apşeron jarьm adasьnьn bir hissəsi ilə byra daxildur. 3) Cəbrajьl kəzasь və 4) Naxçьvan Cumhyrijjəti.



**Sybalpiq və Alp bitqiləri.** Juqsəq dag bitqiləri Azərbajcan daxilində bə'zi jerlərdə çok jajьlmьş və bejuq sahələr dytyr. Bynlardan ən çok Daglьk Karabagda və bejuq Kafkas daglarьnьn Dagьstan sərhəddində olan juqsəq jerlərdə vardyr. Azərbajcanьn Alp dajirəsini iqi bejuq hissəjə ajьrmak olar: aşagь sybalpiq və jykarь-Alp hissələri (zolaklarь), sybalpiq (Alp altь) zolak (hissə) meşələrin jykarь sərhəddilə qedən zolaga dejilir. Beləliqlə by mintəkə meşələrin jykarь sərhəddi ilə əsil Alp bitqilərinin jajьldьgь jerlərin arasьndadyr. Sybalpiq zolaga meşələrdən ajrь-ajrь alçak bojly agaçlar qeçir. Bynlar meşələrin daglarda olan son pionerləridurlər.

Sybalpiq bitqilərin otlarь oldykca hundur olyr. Çok vakt adam bojyndan hundur olan by otlarьn arasьnda ag-sarь tovşançьl oty, badьmcanь mahnьzlь ot, sarь xaç oty, ag çəhrajь pişiq oty, badьmcanь çan (cьnkro) çiçəqi, bejuq qej başlьlar, iri tovşançьl otlar və gejriləri vardyr. By jerlərdə ən çok Kafkas agy agacь (zəkkymy) bylynyr.

Sybalpiq zolakda Alp zolagь qəlir. By zolag sьk jaşьl otlar ilə ertulmuşdur. Alp mintəkəsində otlar sybalpiq zolagda olan kədər hundur olmajьrsa da, bynlar daha sьk daha qezəl və daha əlvan rənqlidur. Muxtəlif çiçəqli zentjanlar, çan (cьnkro) çiçəqlər, daş qəsənlər, pəncəlilər, jarmalьlar, qej ynytma məni çiçəqlər, qezəl ijli ag zanbaklar və bir çok başka parlak əlvan çiçəqlər oldykca qezəl mənzərə jaradьrlar.

Dəniz səthindən olan juqsəqliq artdьkca, həmişə karlьk xəttə janaşdьkca, çəmənlər sejrəlməqə başlajьr. Bitqilər sejrəqləşir, bojlarь qiçilir və jerdən jykarь kalkmajьrlar.

**Kymlyk bitqilər**. Kymlyk jerlərin bitqiləri səhra və jarьm səhra bitqilərinə jakьndyr və kaspi dənizi sahilində bə'zi jerlərdə ensiz, bə'zi jerlərdə enli zolaglarьna rast qəlməq olyr. Kymlyk sahələr bə'zi jerlərdə dəniz sahilindən bir kədər qənarda da. məsələn Şirvan çəlundə də mevcyddyr.

**Sy bitqiləri və sy sevən bitqilər.** Azərbajcanda sy bitqiləri və sy sevən bitqilər az jajьlmьşdyr və bynlara ancak bə'zi jerlərdə Lənqəran duzluqunun qel və bataklьklarьnda („morsy") dejilən jerlərdə) Jevlax, Ləqi və Ycar janьnda Qurun daşdьgь jerlərdə və Qurun aşagь hissəsində Saljan və Mygan çəllərində rast qəlməq olar. Qeniş bataklьk jerlər Kyba duzluqundə, Kaspi sahili byjynda vardyr.

## Toprak.

Azərbajcanda topraklar umymijjətlə kyrşak (mintəkələr) təşqil edir və dəniz səthindən juqsəqliqlərinə nisbətən hissələrə belu-

nurlər. Kaspi dənizi sahilindən başlamьş bөjuq və qiçiq Kafkaz daglarьnьn təpələrinə qibi toprak dəjişir. Dyzly boz toprakdan sonra, boz konyr toprak qəlir. Byndan sonra şahbalьtь toprak və daha sonra kara toprak zolaglarь qəlir. Bir az jykarьda meşə toprагь kyrşagь, byndan sonra dag-çəmən topragь və daha jykarьda dag tyndra topragь qəlir. Professor Zaxarof cumhyrijjətin topraklarьnь aşagьdaqь kyrşaklara bөlur:

1) Duzluq kyrşagь
2) Alçak daglar
3) Orta daglar
4) Hundur daglar.

**Duzluq kyrşagь.** Duzluq toprak kyrşagь Saljan, Mygan, Mil və Şirvan çөllərini Lənqəran ovasьnь və Kysar duzluqunu ihatə edir. By kyrşakda kym çajlar və dənizlərdən jeni jatmьş lajlar boz-konyr dyzlyklar (şoranlar), dyzly topraklar, boz toprak və kismən konyr topraga təsaduf olynyr. Qənt təsərrufatь cihətcə by kyrşak, kijmətli pambьk, quncut, darь və bөjuq syvarma karakterli meliorasja dajirəsidur. Byrada ьşьk və isti çok, amma rutybət azdyr. Çok vakt toprakda çokly dyz olyr.

**Alçak daglar toprak kyrşagь.** By kyrşak bөjuq Kafkaz sьra daglarьnьn şimal və cənyb dəşlərini, Kabristan daglarьnьn jykarь hissəsini, Qəncə və Karabag daglarьnьn aşagь hissəsini, Talьşьn şimali-şərk dөşunu və Naxçьvanьn çok hissəsini dytyr. (Professor Zaxarin tərəfindən tərtib edilmiş Azərbajcanьn sxematiq xəritəsinə bakmalь). By dajirə ən çok açьk və tund şahbalьtь toprak və kismən kara toprak dajirəsidur. Dyzlyklara az təsaduf olynyr.

Qənt təsərrufatь cihətincə by dajirə dəmjə (kyry) və jarь dəmjə əqinçiliq jeridur. By dajirədə bygda, syvarьlan jerlərdə baglar, bostanlar qөrulur: by dajirədə isti çok isə, də sy qifajət edəcəq kədər dejildur. Meliorativ işlərdən ilq nevbədə syvarma və sellər və sellərin qətirdiqi daşlar ilə mubarəzə dyryr. By dajirə hazьrda Azərbajcanь bəsləjən dajirədur. By dajirənin kyry və syvarьlmajan hissələri kьş otaklarь vəzifəsini qөrur.

**Orta daglar toprak kyrşagь.** By kyrşak dəniz səthindən jykarьqь kyrşakdan daha juqsəqdur. Iklimi rutybətli və jymyşakdyr. Byrada meşə topragь (Kyba kəzasь, Zakatala və Nyxa kəzalarьnьn və Daglьk Karabagьn çok hissəsi) sarь toprak, (Lənqəran duzluqunun butun dar zolagь və Talьş sьra daglarьnьn dənizə jakьn rutybətli dөşləri və proljyvial və aljyvial çөquntuləri təsaduf olynyr. By axьrqьlarьn əmələ qəlməsi, palçьk selləri və daglardan çokly qələn dag çajlarьnьn byrakdьklarь çөquntulərin mukəddəratьna baglьdyr. Belə topraklarь Alazanьn (Kanьgьn) sol sahilində Azərbajcanьn gərb hudydyndan başlajarak, Əjri çajьn sag sahilində daglarьn ətəqlərində qөrməq olar və Nyxadan bir az gərbə tərəf Şin çajьna kədər yzanьr.



Insanlar uçun daha saglam olan by kyrşak qənt təsərrufatь cihətincə əvvəlqindən daha fəkirdur. By dajirədə çəlçuluq və maldarlьga, bagçьlьk, arьçьlьk və ipəqçiliq də ilavə olynyr. Zənqin sarь topraklarь ajrьca kejd etməq lazьmdyr. Bөjuq mikdardə əqilən çəltiqdən başka by kyrşaga hə'zi sybtropiq və texniqi bьtqilərin (japon xyrmasь, əzqil, qagьz islak agaçlarь, çaj və gejriləri qibi) əqilməsi uçun istifadə olyna bilər.

**Juqsəq daglar kyrşagь.** Juqsəq daglar kyrşagь ən juqsəq jer dytyr. Iklimi sojyk kutub ikliminə jakьn olyb, temperatyry çok tez dəjişir. By jerlərdə sybalpiq və alp çəmənlərinə təsaduf olynyr, ən juqsəq jerlərdə isə ja ancak josyn bylynyr, ja da tamamilə bitqi olmajьr. Byrada kara topraga oxşar toprak, torf dag çəməni və dag tyndra topraklarь vardyr.

Qənt təsərrufatь cihətincə juqsəq dag kyrşagь qeniş otlak, jajlak jeridur. Jajlaklar aşagьlarda duzluqlərdə olan kьş otlaklarьnьn (kьşlak və jajlaklarьn) təbii ilavəsidur. By kyrşak Azərbajcan sьra daglarьnьn hamь juqsəq nөktələrində bylynyr.

ӨZU-ӨZUNU JOKLAMA SYALLARЬ.

Aşagьdaqь syallarь jaxşь fiqirləşib verilmiş iş materjalьna qөrə təhlil ediniz:

1) *Azərbajcanьn mevkeini (en-yzynlygynv) tə'jin ediniz.*
2) *Xəritədə Azərbajcanьn hudydlarьnь qөstəriniz.*
3) *Şakyli istikamət uzrə Azərbajcanьn yzynlygyny hesab ediniz.*
4) *Azərbajcanьn ən juqsəq təpələrini sajьnьz və xəritədə qөstəriniz.*
5) *Azərbajcanьn çөllərini sajьnьz və xəritədə qөstəriniz.*
6) *Xəritədə Azərbajcanьn çajlarьnь və qөllərini qөstəriniz.*
7) *Istiliq və rutybət cihətincə jerin juqsəqlijinin Azərbajcan iklimina nə qibi tə'siri vardyr?*
8) *Kaspı dənizinin Azərbajcan iklimina nə qibi tə'siri vardyr?*



9) *Lənqəran duzluqu və Talьş daglarьnьn çok rutyвətlı olmasь nədəndur?*

10) *Sьra daglarь Azərвajcan iklimine nə qısi tə'sir edirlər?*

11) *Qunəş duşən muddət, Azərвajcanda nə kədərdur?*

12) *Azərвajcanda nə kədər iklim kyrşaklarь vardyr?*

13) *Hər вir kyrşagьn sifətlərini qəstəriniz.*

14) *Azərвajcanьn вitqi və toprak kyrşaklarьnь sajьnьz və sifətlərini (muxtəsər svrətdə) qəstəriniz.*

## Dərsi təhlil etməq usyly.

Umymijjətlə hər bir cografi materjalьn təhlili qibi, by dərsi də təhlil etdiqdə karşьda Məarif Komisarlьgь tərəfindən nəşr edilmiş xəritənin bylynmasь çok lazьmdyr. Dərsdə okynmyş hər bir təbii-cografi istilahlar (çajlar, daglar və iləx) xəritədə qəstərilməlidur.

Belə bir çalьşma da çok mənfəətli olyrdy: Azərbajcanьn kontyrly xəritəsində rast qələn adlarь kejd etməli. Azərbajcanьn mevkeini tə'jin etdiqdə en və yzynlygyn nə deməq oldygyny xatьrlamak lazьmdyr.

Dərs qeçildiqdə rast qələn dijagramlarь qəzdən qeçirməq ilə qifajətlənməməli, by dijagramlarь əz dəftərinizə qəçurunuz. Jalьnьz qərməq ilə qifajətlənməməlidur.

Xusysən bir numrəli əməli işi qərməq çok tevsijə olynyr.

By dərs uçun istifadə edilə bilinəcəq əsərlər (rys dilindədurlər):

**Мих. Авдеев.** „Территория и население Азербайджана", стр. 11—14 (Перспективный план восстановления и развития хозяйства на 1926 г).

**Ляйстер и Чурсин.** „География Кавказа", стр. стр. 75—84, 177—178, 181, 203—205, 208—212, изд. Закавказ. Коммун. Университета, 1924 г.

**Гроссгейм.** „Краткий очерк растительного покрова Азербайджана", стр. 3—29, изд. комиссии по районированию Азербайджана, 1926 г.

**Захаров.** „Краткий почвенно-географический очерк АССР" стр. 45—65, то же издание.

**Фигуровский.** „Климатическое районирование Азербайджана". стр. 13—29, то-же издание.



IŞ №1.

Byrada Azərвajcanьn qiçiq вir xəritəsini çəqiniz.

**Kejd:** Bynyn uçun bəjuq bir xəritə qəturunuz. By xəritədə iqi çaprazь xət çəqiniz (Şimal-cənyb və gərb-şərk xətləri). Sonra mikjas qəturməlisiniz. Mikjasь elə qəturməli qi, butun xəritə səhifənizdə jerləşə bilsin. By mikjasь çəqməq lazьmdyr. Bylyndygynyz şəhəri (qəndi) tapьnьz və munasib jerdə dajirə şəqlində kejd ediniz. Başka şəhərləri (qəntləri) hər bir məsafəni mikjas ilə əlçub kejd etməq lazьmdyr. Çajlarьn və hudydlarьn qedişini qəzə jarь kejd ediniz. Hər şeji əvvəl jymyşak, kara karandaş ilə sonra ustdən murəqqəb ilə çəqiniz. Jazьlar jerinə rəkəmlər kojmak olar. Rəkəmlərin nə qəstərdiqini başka jerdə izah etməq olar.




Məəryt işarələr

Cumhyrijjət şəhəri

Kəza şəhərь

Qənt

Dəmir joly

Şossa

Mikjas 1:



*DƏRS №2.*

## DƏRSIN MƏZMYNY

### Azərbajcanьn əhalisi.

Əhalinin umymi mikdarь, əhalinin cinsi hej'əti, əhalinin kəzalar uzrə və şəhər və qənt arasьnda вəlunməsi, əhalinin millijjət, ictimai vəzijət, xusysi fə'alijjət, jaş, savad və sьklькca təksimi.

### Dərsə ajid izahat.

**Əhalinin umymi mikdarь.** 17 dekabr 1926-il sijahisi uzrə Azər ajcanьn umym əhalisinin mikdarь 2 302.040 nəfərdur. By mikdar Umym Şyralar Ittifakь əhal s nin (146.302.375 nəfərin) 1,5 % və Zakafkasija əhalisinin (5.814.365 nəfərin) 39,6 % təşqil edir.

**Əhalinin cinsi hej'əti.** 2.302 040 nəfər umym əhalinin 48 % kədərini (1.102.969 nəfəri) kadьnlar və 52 % kədərini (1 199.071 nəfəri) ərqəqlər təşqil edir.

ƏHALЬ KƏZALAR UZRƏ BELƏ TƏKSIM OLYNYR:

| | KƏZALAR | UMYM ƏHALЬ | | |
|---|---|---|---|---|
| | | Hər iqi cins 2.302 040 | Qişi 1.199.071 | Kadьnlar 1.102.969 |
| 1 | Baqь kəz sь | 520.396 | 266.577 | 253 819 |
| 2 | Agdam „ | 121 304 | 66.200 | 58.104 |
| 3 | Ƣəncə „ | 204 768 | 107 342 | 97.426 |
| 4 | Ƣɵjçaj „ | 173.667 | 92.216 | 81.451 |
| 5 | Cəbrajil „ | 751.147 | 39 081 | 36.066 |
| 6 | Zakatala „ | 80.0 8 | 42 541 | 37.497 |
| 7 | Kazak „ | 121 016 | 64.441 | 56.605 |
| 8 | Kyba „ | 188.204 | 97.198 | 91.106 |
| 9 | Qurdustan „ | 51.509 | 26.681 | 24.828 |
| 10 | Lənqəran „ | 207.852 | 107.456 | 100.396 |
| 11 | Nyxa „ | 106.961 | 56 919 | 50 042 |
| 12 | Səljan „ | 128.390 | 68.519 | 60 231 |
| 13 | Şamaxь „ | 91.029 | 47 029 | 41.000 |
| 14 | Myxtar Daglьk Karabag | 125 59 | 2.957 | 62.202 |
| 15 | Naxçьvan Şyra Cəmhyrijjəti | 103.600 | 54.304 | 49.296 |



Beləliqlə ən çok əhalisi olan kəzalar: Baqь (22,6 %.) Lənqəran (9 %), Ƣəncə (9 %) kəzalarьdyr. Ən az əhalisi olan Qurdustan (2,2 %) və Cəbrajil (3,2 %) kəzalarьdyr.

ŞƏHƏR ƏHALISININ KƏZALAR UZRƏ TƏKSIMI:

| | Şəhər əhalisi | | |
|---|---|---|---|
| | Hər iqi cins 637.814 | Qişilər 327.379 | Kadьnlar 310.435 |
| Baqь kəzasь | 446,832 | 228,174 | 218,658 |
| Agdam „ | 10,513 | 5,591 | 4,922 |
| Ƣəncə „ | 61,578 | 31,869 | 29,709 |
| Ƣɵjçaj „ | 10,978 | 6,005 | 4,973 |
| Cəbrajil „ | 3, 52 | 1,685 | 1,467 |
| Zakatala „ | 3,269 | 1,782 | 1,487 |
| Kazak „ | 6,729 | 3,598 | 3,131 |
| Kyba „ | 16,543 | 8,080 | 8,463 |
| Qurdustan | 434 | 339 | 95 |
| Lənqəran „ | 12,631 | 6,526 | 6,105 |
| Nyxa „ | 22,965 | 12,078 | 10,887 |
| Səljan „ | 13,115 | 6,611 | 6 504 |
| Şamaxь „ | 7,614 | 3,832 | 3,782 |
| Myxtar Daglьk Karabag | 8,225 | 4,133 | 4,092 |
| Naxçьvan cumhyrijjəti | 13,236 | 7,076 | 6,160 |

Beləlıqlə şəhər əhalisinin ən çoky Baqь kəzasьnda—70 %, Ƣəncə kəzasьnda—9 % və Nyxa kəzasьnda—3 % jaşajьr; şəhər əhalisinin belə təksim olmasь aşqar bir şejdur, çunqu Azərbajcanьn ən çok əhalisi olan şəhərlər—Baqь, Ƣəncə və Nyxa—by kəzalarьn m rqəzləridurlər.

Qurdustan, Cəbrajil və Zakatala kəzalarьnda əhalinin çok azlьgь nəzəri cəlb edir. Şəhər əhalisinin by kəzalarda az olmasь by kəzalarьn sьrf qənt təsərrufat kəzalarь oldygyny gəstərir.

### QƏNT ƏHALISININ KƏZALAR UZRƏ TƏKSIMI.

| | Qənt əhalisi | | |
|---|---|---|---|
| | Hər iqi cins 1.664.226 | Qişilər 871.692 | Kadьnlar 792.534 |
| Baqь kəzasь | 73.564 | 38.403 | 35.161 |
| Agdam " | 113.791 | 60.609 | 53.182 |
| Ǵəncə " | 148.190 | 75 473 | 67.717 |
| Ǵøjçaj " | 162.689 | 86.211 | 76.478 |
| Cəbrajil " | 71.995 | 37.396 | 34 599 |
| Zakatala " | 76.769 | 40.759 | 36.010 |
| Kazak " | 114 287 | 60.813 | 53 474 |
| Kyba " | 171.661 | 89.118 | 82.543 |
| Qurdustan " | 51.075 | 26.342 | 24.733 |
| Lənqəran " | 195.221 | 100 930 | 94.291 |
| Nyxa " | 83 996 | 44.841 | 39 155 |
| Səljan " | 128.390 | 68.159 | 60.231 |
| Şamaxь " | 91.029 | 47.029 | 44.000 |
| Myxtar Daglьk Karabag | 125,159 | 62 957 | 62.202 |
| Naxçьvan Cumhyrijjəti | 103.600 | 54.304 | 49.296 |

Beləliqlə qənt əhalisi ən çok Lənqəran (12%), Kyba (10%), Ǵøjçaj (10%) kəzalarьnda jerləşmişdur.

**Əhalinin qənt ilə şəhər arasьnda bølunməsi.** Cumhyrijjətin 2.302.040 nəfər umym əhalisinin 637.814 nəfəri, jə'ni 27,6% şəhərlərdə və 1.664.226 nəfəri, jə'ni 72,3% kəzalarda jerləşmişdur. Azərbajcanda şəhər əhalisinin fajizi (27,6%) Umym Şyralar Ittifakьnьn şəhər əhalisinin orta fajizindən (18%) artьkdyr. Azərbajcanda şəhər əhalisi çok sur'ətlə artьr 1920 21-ci ilin sijahьsьna ǵørə Azərbajcanda 394.554 nəfər şəhər əhalisi var idi. 1923-də by ədəd 484.495-ə çatdь, jə'ni 20% artdь. 1926-da isə 637,814-ə çьkdь qi, 1920-21-ci illərə nisbətən 61% artmьş oldy.

Kəzalar içərisində şəhər əhalisi ən çok olan Baqь kəzasь 86% və ən az şəhər əhalisi olan Qurdustan kəzasьdyr - 0,9%.

### AZƏRBAJCAN ŞYRA CUHYRIJJƏTININ BØJUQ ŞƏHƏRLƏRININ ƏHALISI.

| | | |
|---|---|---|
| Baqь və mə'dən dajirələri | 446.832 | nəfər [1] |
| Ǵəncə | 55.510 | " |
| Nyxa | 22.965 | " |
| Kyba | 13.256 | " |
| Lənqəran | 11.878 | " |
| Naxçьvan | 8,916 | " |
| Saljan | 8.252 | " |
| Agdam | 8.153 | " |
| Şyşa | 5.107 | " |
| Agdaş | 4.539 | " |

**Əhalinin millijjət uzrə bølunməsi:** Azərbajcanьn butun əhalisi millijjətcə aşagьdaqь kərar uzrə bølunur:

1) Baqь Şyrasь sədri joldaş Konyşqinin Moskvadaqь mə'ryzəşinə ǵørə 1928-ci ildə Baqь əhalisi 506.000-ə qibi olmyş.



### Azərbajcanьn əhalisini millijjətcə bølunməsi cədvəli

| | QƏNT ƏHALISI | | | ŞƏHƏR ƏHALISI | | | JƏQYNY | | | %% ilə |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Qişilər | Kadьnlar | Hamьsь | Qişilər | Kadьnlar | Hamьsь | Qişilər | Kadьnlar | Hamьsь | |
| Ryslar (ykrajnalьlar, belosyslar). | 27.575 | 22.690 | 50.265 | 96.793 | 95.200 | 191.993 | 124.368 | 117.890 | 242.258 | 10.4 |
| Turqlər | 628.864 | 564.970 | 1.193.834 | 129.567 | 114.576 | 244.143 | 758.431 | 679.546 | 1,437.977 | 62.1 |
| Nemslər | 1.329 | 1.405 | 2.734 | 4.706 | 5.709 | 10.415 | 6,035 | 7.114 | 13.149 | 0.6 |
| Jəhydilər (Avropalь, dag, ǵurcu karaim və orta Asja jəhydiləri) | 989 | 820 | 1.809 | 14.312 | 15.222 | 29.534 | 15.301 | 16.042 | 31.343 | 1.4 |
| Tatarlar | 279 | 136 | 415 | 5 276 | 4.257 | 9.533 | 5.555 | 4.393 | 9.948 | 0.4 |
| Ǵurculər | 3.247 | 2.620 | 5.867 | 2.185 | 1.400 | 3.585 | 5.432 | 4.020 | 9.452 | 0.4 |
| Dagьstan xalklarь (ləzǵilər) avarlar və gejriləri | 37.585 | 32.457 | 70.042 | 3.663 | 1.779 | 5.442 | 41.248 | 34.236 | 75.484 | 3.3 |
| Ermənilər | 90.927 | 87.797 | 178.724 | 53.950 | 49 330 | 103.280 | 144.877 | 137.127 | 282.004 | 12.2 |
| Qurdlər | 21.103 | 19,817 | 40.920 | 177 | 96 | 273 | 21.280 | 19.913 | 41.193 | 1.8 |
| Talьşlar | 39.770 | 37.273 | 77.043 | 190 | 90 | 280 | 39.960 | 37.363 | 77.323 | 3.4 |
| Tatlar | 11.392 | 9.934 | 21.326 | 3.502 | 3.615 | 7.117 | 14.894 | 13.549 | 28.445 | 1.2 |
| Iranlьlar | 911 | 429 | 1.340 | 4.635 | 3.471 | 8.106 | 5.546 | 3.900 | 9.446 | 0.4 |
| Gejr millətlər (estonlylar, latьşlar, çinlilər və gejriləri | 10 563 | 10.132 | 20.695 | 19.369 | 16.487 | 35.856 | 29.932 | 26.619 | 56.551 | 2.1 |
| JEQYNY | 874.534 | 790.480 | 1.665.014 | 338.325 | 311.232 | 649.557 | 1.212.859 | 1.101.712 | 2.314.571 | 100 |

Beləliqlə mikdarca birinci jeri turqlər (62,1%, iqinci jeri ermənilər (12,2%) və uçuncu jeri ryslar (10,4%) dytyrlar.

**Kejd:** Əvvəlqi cədvəl ilə by cədvəldə şəhər əhalisi ilə qənt əhalisi arasьnda ǵørunən bir kədər fərk əvvəlqi cədvəldə ilq mə'lymat içincidə isə son mə'lymat ǵøstərildiǵindəndur.

**Azərbajcan əhalisinin millijətcə bəlməsini qəstərən diagram**



**Azərbajcan əhalisinin cinsijjətcə bəlunməsini qəstərən diagram.**

ȜƏNT ƏHALİSİ 1665014

KADЬNLAR 790480

QİZİLƏR 874534

ЗƏHƏR ƏHALİSİ 649557

KADЬNLAR 311232

QİZİLƏR 338325

JEQYNY 2314571

KADЬNLAR 1101712

QİZİLƏR 1212859

Əldə edilmiş fajizlər uzrə (son cədvələ bakmalь). Azərbajcan əhalisinin millijjətcə bəlunməsini qəstərən duz bycaklь diagram tərtib edəlim.

Baqь şəhər və mə'dənlər dajirəsində (Kara şəhər, Ag şəhər, Bajьl, Bibi-Hejbət dajirəsi, Lenin dajirəsi) əhalinin millijjətcə tərqibini qərməq maraklь olyrdy.

**BAQЬ ŞƏHƏR ƏHALISININ MILLIJJƏTCƏ TƏKSIMI:**

| | Baqь şəhəri | | | Mə'dən - zavod dajirələri | | | Hamьsь | | | % | dajirənin dərəcələri |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Qişilər | Kadьnlar | Hamьsь | Qişilər | Kadьnlar | Hamьsь | Qişilər | Kadьnlar | Hamьsь | | |
| Ryslar (ykrajnalьlar, beloryslar) | 58.963 | 64.971 | 123.934 | 22.933 | 22.610 | 45.543 | 81.896 | 87.581 | 169.477 | 37,4 | 134 |
| Turqlər | 48.885 | 42.154 | 91.039 | 14.678 | 13.022 | 27.700 | 63.563 | 55.176 | 118.739 | 26,3 | 94,7 |
| Ermənilər | 35.873 | 33.671 | 69.544 | 4.031 | 3.081 | 7.112 | 39.904 | 36.752 | 76.656 | 17 | 61,2 |
| Jəhydilər | 10.302 | 11.028 | 21.330 | 432 | 392 | 824 | 10.734 | 11.420 | 22.154 | 5 | 18 |
| Iranlьlar | 2.924 | 2.164 | 5.088 | 1.345 | 1.107 | 2.452 | 4.269 | 3.271 | 7.540 | 1,7 | 6,1 |
| Ləzqilər | 885 | 274 | 1.159 | 1.706 | 843 | 2.549 | 2.591 | 1.117 | 3.708 | 0,9 | 3,3 |
| Qurculər | 1.397 | 906 | 2303 | 133 | 92 | 225 | 1.530 | 998 | 2.528 | 0,5 | 1,8 |
| Gejri millətlər | 18.440 | 14.553 | 32.993 | 10.916 | 8.592 | 19.538 | 29.386 | 23.145 | 52.531 | 11,2 | 40,3 |
| Jeqyny. | 177.669 | 169.721 | 347.390 | 56.204 | 49.739 | 105.943 | 233.873 | 219.460 | 453.333 | 100 % | 360 |

Mutlək ədədləri nisbət ədədlərə (fajizlərə) belə çevrilir.

$$453.333 - 100\%$$
$$169.477 - x$$
$$x : 100 = 169.477 : 453.333$$
$$x = \frac{100.169.477}{453.333} = 37,4$$

**AZƏRBAJCAN ƏHALISININ JAŞ UZRƏ BƏLUNMƏSI**

(1926-cь ilin sijahьsь uzrə)

| Jaş gryplarь | Jaşlar 0—9 | | 10—24 | | 25—59 | | 60 və jykarь | | Hamьsь | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Qişi | Kadьn | Qişi | Kadьn | Qişi | Kadьn | Qişi | Kadьn | Qişi | Kadьn |
| | 371.280 | 365.499 | 319.368 | 268.268 | 453.324 | 423.657 | 68.887 | 44.288 | 1.212.859 | 1.101.712 |
| % % | 30,6 | 33,2 | 26,4 | 24,3 | 37,4 | 38,5 | 5,6 | 4,0 | 100 % | 100 % |
| Dajirənin dərəcələri | 110,2 | 119,5 | 95,0 | 87,5 | 134,6 | 138,6 | 20,2 | 14,4 | 360° | 360° |



Əhalinin jaş uzrə olan hej'ətini dajirə diagram syrətində qөstərəlim (ərqəqlər və kadьnlar uçun):




Şəqil-1

By cədvəllərə bakdьkda əhalinin (istər ərqəqlərin, istər kadьnlarьn) ən çok fajizini 0—9 və 25—59 jaşa qibi olanlar təşqil etdiqini qөrүruz. Ən az 60-dan jykarь olanlardandyr. Bynyn belə olmasь təbiidur.

Fajizlərdən isə dajirənin dərəcəsinə belə qeçilər:

$$(\text{dajirənin})\ 100\ \% - 360°$$
$$37,4\% - x°$$
$$x = \frac{360.37,4}{100} = 134,6°.$$

Azərbajcan əhalisinin işləməsi, əsas sən'ətdə olan mevkei və zəhmət nev'ləri uzrə təksimi nəzərdən qeçirməq maraklь olyrdy.

| | QƏNT TƏSƏRRUFATЬ | 30110 |
|---|---|---|
| Işçilər | Fabriq-zavod sənajei | 3.335 |
| | Xьrda əl-sənajei | 1.190 |
| | Inşaatçьlar | 1.434 |
| | Dəmir jol nəklijjatь | 2.333 |
| | Nəkiijjatьn başka nev'ləri | 193 |
| | Ticarət, kredit | 34 |
| | Muəssəsələr | 141 |
| | Başka əməq nev'ləri | 25.099 |
| | Işçılərin jəqyny | 63.869 |
| Kyllykçylar | Qənt-təsərrufatь | 612 |
| | Fabriq-zavod sənajei | 382 |
| | Xьrda əl sənajei | 33 |
| | Inşaatçьlar | 247 |
| | Dəmir jol nəklijjatь | 711 |
| | Nəklijjatьn gejr nev'ləri | 54 |
| | Ticarət, kredit | 673 |
| | Muəssəsələr | 5.055 |
| | Başka əməq nev'ləri | 1.193 |
| | Kyllykçylarьn jəqyny | 9.959 |
| Myzd ilə işləjən işçiləri olan təsərrufat sahьblarь | Qənt-təsərrufatь | 9.851 |
| | Fabriq-zavod sənajei | 12 |
| | Xьrda əl sənajei | 321 |
| | Inşaat işlərini podrata qeturənlər | 29 |
| | Nəklijjat | 24 |
| | Ticarət | 110 |
| | Başka əməq nev'ləri | 4 |
| | Myzd ilə işləjən işçiləri olan təsərrufat sahьblarь | 10.351 |
| | Azad sən'ət adamlarь | 713 |
| Azad sən'ət adamlarь | | |
| Ajilə əfradь və artel uzvləri ilə çalьşan təsərrufat sahьblarь. | Qənt təsərrufatь | 194.345 |
| | Əl sənajei | 2.921 |
| | Inşaat | 494 |
| | Nəklijjat | 506 |
| | Ticarət | 529 |
| | Zəhmətin başka nev'ləri | 2 |
| | Ajilə əfradь və artel uzvləri ilə çalьşan təsərrufat sahьblarьnьn jəqyny | 198.797 |
| Işə qəməq edən ajilə əfradьnьn sajь. | Qənt təsərrufatь | 215.947 |
| | Əl sənajei | 2.115 |
| | Inşaat | 59 |
| | Nəklijjat | 319 |
| | Ticarət | 323 |
| | Zəhmətin başka nev'ləri | 239 |
| | Işə qəməq edən ajilə əfradьnьn jəqyny | 219.002 |
| Təqlər. | Qənt təsərrufatь | 73.418 |
| | Əl sənajei | 59.228 |
| | Inşaat | 1.693 |
| | Nəklijjat | 2.177 |
| | Ticarət | 2.489 |
| | Zəhmətin başka nev'ləri | 34 |
| | Təqlərin jəqyny | 91.249 |
| Məşgələləri olmajan və ja qestərməjən adamlar | | 9.501 |
| Işsizlər | | 795 |
| On jaşьndan jykarь ezləri işləjənlər | | 504.405 |
| On jaşьndan jykarь ezləri işləməjənlər | | 506.860 |
| On jaşьndan qiçiq əhali | | 553.749 |
| Umym əhali | | 1.665.014 |
| Qənt təsər. çalьşanlarla başka işləri olanlar | Myzdyr işçiləri olan təsərrufat sahьblarь | 556 |
| | Ajilə əfradь və artel uzvləri ilə çalьşan təsərrufat sahьblarь | 7.032 |
| | Təqlər | 2.424 |
| | Işə qəməq edən ajilə əfradь | 3.134 |



By iqi cədvələ bakdьkda cumhyrijjətimizdə 300 392 təsərrufatьn oldygyny qeruruz. Bynlardan myzdur işçilər ilə işləjənlər 10 351 (3,4%) ancak ajilə əfradь və artel uzvləri ilə işləjənlər —198.797 (66.2%), təqlər—91,244 (30,4%) dyr, təsərrufatьn umym sajlarьndan ən çokyny qənt-təsərrufatь təşqil edir. Beləliqlə Azərbajcanьn qənt təsərrufat məmləqəti oldygy bir daha sybyt olynyr. Qənt təsərrufatьnda olan işçilər və kyllykçylarьn sajь çok azdyr. Bynlarьn hamьsь bir jerdə 73.828 nəfərdur qi, qənt qişi əhalisinin 9%-ni təşqil edirlər. (Qənt təsərrufatьnda işləjən işçi və kyllykçylarьn ən çok qişilərdən oldygyny nəzərə almak lazьmdyr.) Sərbəst sən'ət adamlarьnьn sajь çok az—713 nəfərdur.

Azərbajcanьn 1.665 014 nəfər olan butun qənt əhalisi ez-ezunə işləməsi uzrə belə belunur: ezunə işləməjən və on jaşьndan aşagь olanlar 504.405 nəfər (30,3%) ez-ezunə işləməjən və on jaşьndan jykarь olanlar—506 860 nəfər (30.4%) və ezunə işləjənlər—553.749 nəfər (33,2%). Beləliqlə qənt əhalisi arasьnda orta hesab ilə hər bir nəfər ezunə işləjənə, iqi nəfər ezunə işləməjən duşur.

Qənt təsərrufatьnda məşgyl olanlardan 13.146 nəfərinin (umym qənt ərqəqlərinin 1,6%) qənt təsərrufatьndan qənar işləri də vardyr.

Cumhvrijjətin butun ez-ezunə işləjən əhalisi belə belunur:

| | | |
|---|---|---|
| Myzd ilə işləjən işçiləri olan təsərrufat sahьblarьnьn ehdəsində | 37.056 | nəfər |
| Ancak ajilə əfradь və artel uzvləri ilə çalьşan təsərrufat sahьblarьnьn ehdəsində | 676.568 | „ |
| Təqlərin ehdəsində olan | 211.835 | „ |
| Məşgələləri olmajan və ja qestərilməjənlər | 13.563 | „ |
| Işsizlər | 728 | „ |
| On jaşa qibi ezlərinin mustəkil jaşamalarь uçun vəsajiti olanlar | 93.32 | „ |




Şəqıl-2. Şəqll-3.

Cəmi 1077,4 min heqtar mikdarьnda olan kьşlaklar sahəsi 1689 parçadan ibarət olyb kəzalar arasьnda belə bɵlunur:

| | | | | | | |
|---|---|---|---|---|---|---|
| Ƣəncə | kəzasь | 239 | parça, | sahəsi | 183,7 | min heqtar |
| Baqь | „ | 131 | „ | „ | 142,6 | „ |
| Saljan | „ | 171 | „ | „ | 139,8 | „ |
| Kazax | „ | 257 | „ | „ | 135,3 | „ |
| Ƣɵjçaj | „ | 111 | „ | „ | 74,3 | „ |
| Cəbrajьl | „ | 123 | „ | „ | 72,3 | „ |
| Agdam | „ | 281 | „ | „ | 59,4 | „ |
| Şamxor | „ | 27 | „ | „ | 52,5 | „ |
| Şamaxь | „ | 127 | „ | „ | 50,0 | „ |
| Zakatala | „ | 61 | „ | „ | 34,1 | „ |
| Şəqi | „ | 53 | „ | „ | 31,4 | „ |
| Agdaş | „ | 77 | „ | „ | 27,8 | „ |
| Kyba | „ | 31 | „ | „ | 8,9 | „ |
| Naxçьvan ɵlqəsi | | | | | 65,4 | „ |

Qurdustan və Lənqəran kəzalərilə Myxtar Daglьk Karabag əjalətində kьşlak jerləri heç jokdyr.

Kьş otlaklarь, aran jerlərdə olyb, jazda istidən butun bitƣisi janmьş otlaklara dejərlər. Kьşda byralarda incə kar təbəkəsi altьnda, kismən pajьz jagьşlarьndan sonra bitmiş və kismən jazdan kalmьş ot olyr; by ot mal-karanьn jemini təşqil edir. Kьşlaklar sysyz duz jerlərdə olar. By syrətlə, kьşlaga qeçən bir maldarьn bɵjuq bəlasь sy kəhətliƣidur. Mal-karanьn çok pis bir sy ilə qifajətləndiƣi və ja jakьn bir çajь aktarmak uçun yzak məsafələrə ƣetməsi ittifaklarь az dejildur. Hər iqi ittifakda mal-kara əzijjət çəqir və kьş fəslinin axьrьna ƣɵzə çarpacak dərəcədə arьklajьr.

Azərbajcanda maldarlьk təsərrufatь aparьlmasьnьn əsaslandьgь baza, jaz otlaklarьdyr. Kьş otlaklarь, jajlak jollarьnьn baglandьgь ajlarda jaz otlaklarьnь əvəz edirlər. Adəta jajlaga maj ajьnda qɵç başlajьr. Kar əridiqcə mal-kara javaş-javaş daha juqsəqlərə kalkьr və ijylyn axьrlarьnda daimi kar xəttinə çatьr. Daglarda kar nisbətən ƣec ərijirsə, və ejni zamanda jaz jagьşь az olmyş olyrsa, kьşlaklarda otlajan mal kara aclьk çeqməƣə başlajьr. 1924-cu ildə Cumhyrijjətimizdə oldygy qibi kьşda çokly kar jagarsa, malkara kar altьndan çətinliqlə ɵzunə jem çьkarьr, və aclьk çeqməƣə başlajьr. Jazьn tez ƣirməsi də qeçərijə zərərdur; belə bir ittifakda qeçəri, həşarat və zərərli gazlarьn əmələ ƣəlməsindən dolajь vaktьndan kabak kьşlakdan ƣətməƣə məcbyr olyr.

Azərbajcan turqlərinin jajlaga olan mɵhubbət və həvəsi çokdyr; və by həvəs onyn uçun zəryridur. Qəntçilərin iktisadi jaşajьşьnь tədkik edən bir alim jajlaga qeçməƣi və qeçun başlanmasьnь



belə təsvir edir: "Hər bir turq butun kьşь ancak qɵç vaktьnьn başlanmasьndan fiqir edir. Jajlak həjatь, by həjatьn butun çətinliqlərinə bakmajarak, qeçərijə ƣɵzəl bir həjat qibi ƣɵrunur. Maldar, kьşda jəməq azlьgьndan arьklamьş mal-karanь jajlakda qɵqəltməq ymydilə jaşajьr. Ev kadьnь, ajilə əfradьnьn busbutun jьrtьb dagьtdьgь pal-paltarь, sut məhsylynyn və qɵrpə mal-karanьn satьşьndan ələ ƣəlmiş ilq para ilə təzələnməq fiqrini çeqir. Zəhmətqəş qəntçi qeçəri həjatьnda dincliq aktarьr. Birisi dag havasilə saglamlьgьnь duzəltməq, o biri isə ƣɵzəl sojyk kajnama syjyny içmə fiqrində olyr; və heç bir turq tapьlmaz qi, onyn ƣɵzundə jajlak həjatь ƣeniş və bəxtəvər bir həjat olmasьn. Jajlaga varlь qəntçi və orta qəntçi ajiləsi qeçur; fəkət bynlarьn ardьnca heç bir şej olmajan joksyl qəntçi də jajlaga ƣədir".

### 3. Mal-karanьn umymi mikdarь və bynyn nev'lərə ajrьlmasь.

**1913-ci ildən 1926-ci ilə kədər mal-kara nev'lərinin mikdarь (min ilə ƣɵstərilir).**

| | 1909/13 | 1917 | 1926 |
|---|---|---|---|
| 1. Atlar | 177 | 153 | 168 |
| 2. Byjnyzly iri mal | 1636 | 1133 | 1370 |
| 3. Kojynlar | 2588 | 2020 | 2439 |
| 4. Qeçilər | 215 | 152 | 305 |
| 5. Donyzlar | 22 | 15 | 19 |
| Cəmi | 4638 | 3173 | 4301 |
| | 100 | 71,8 | 92,8 |

Deməli 1926-ci ildə mal-karanьn umymi mikdarь muharəbədən əvvəlqi mikdara çatmaga az kalmьş imiş; ejni zamanda 1917-ci ilə nisbətən by mikdar çok artmьşdyr. By syrətlə hər 100-baş mala duşur:

| | 1909/13 | 1926 |
|---|---|---|
| 1. At . . . | 3,8 | 3,9 |
| 2. Byjnyzly iri mal | 35,9 | 31,9 |
| 3. Kojyn | 55,8 | 56,7 |
| 4. Qeçi | 4,6 | 7,0 |
| 5. Donyz | 0,5 | 0,5 |

Byradan ƣɵrulur qi, muharəbədən əvvəl və 1926-cь ildə mal-karanьn tərqibi dəjişiqsiz kalmьşdyr. Mal-karanьn çok jarьsь kojyndyr. Kojynlara qeçiləri də ilavə edərsəq, byjnyzly xьrda hejvan butun mal-karanьn 60%-ni təşqil edər. Byny butun Zakafkasija Cumhyrijjətlərində ƣɵruruq; mal-karanьn uçdə bir hissəsini byjnyzly iri mal təşqil edir; atlarьn mikdarь isə cumhyrijjətdə mevcyd butun mal-karanьn 1/20 hissəsinə musavidur.

1917 VƏ 1926-CЬ ILLƏRDƏ AZƏRBAJCAN CUMHYRIJJƏTINDƏ 100-QƏNTÇI TƏSƏRRUFATЬNA DUŞƏN KARA MALЬN MIKDARЬ.

| Illər. | Butun kara-mal nev'lərinin mikdarь jeqyny. | Atlar | | | Byjnyzly iri mal və camyş | | | | By cumlədən Kojynlar. | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | Işləq | Kylan. | Jeqyny. | Əquz, qəl və işləq camyşlar. | Sagmal inəq və camyşlar. | Cavan | Jeqyny. | Dişi və ərqəq kojyn. | Kyzy. | Jeqyny. |
| 1917 | 1303 | 42 | 15 | 57 | 115 | 140 | 163 | 418 | 655 | 91 | 746 |
| 1921 | 672 | 26 | 7 | 33 | 80 | 105 | 106 | 291 | 246 | 38 | 281 |
| 1926 | 1306 | 38 | 13 | 51 | 121 | 131 | 160 | 412 | 483 | 249 | 732 |

| Illər. | Qeçilər. | | | Donyzlar. | | | Dəvələr. | | | Katьrlar. | | | Eşəqlər. | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Dişi və ərqəq qeçi. | Oglag. | Jeqyny. | Iri donyz | Cavan və bala | Jeqyny. | Işləq | Qəvşəq | Jeqyny. | Işləq | Cavan | Jeqyny. | Işləq. | Kodyk. | Jeqyny. |
| 1917 | 46 | 10 | 56 | 3 | 2 | 5 | 5 | 0 | 5 | 1 | 0 | 1 | 14 | 1 | 15 |
| 1921 | 37 | 9 | 46 | 2 | 3 | 5 | 2 | 0 | 2 | 0 | 0 | 0 | 9 | 1 | 10 |
| 1926 | 56 | 36 | 92 | 3 | 2 | 5 | 1 | 0 | 1 | 1 | — | 1 | 10 | 3 | 13 |



## 4. Azərbajcanьn mal kara ilə tə'min edilməsi.

By Azərbajcanьn kara-mal ilə umymi tə'minliqini kəzalar arasьnda pajladьkda, 1926-cь ildə „butun kara-mal mikdarь jəqyny" ilə orta mikdardan artьk (1306-dan artьk) Zakatala, Kazax və Şəqi kəzəlarьnьn tə'min olyndygy və orta mikdardan az—Baqь, Qəjçaj, Lənqəran kəzalarilə Daglьk Karabag və Naxçьvan Şyra Cumhyrijjətinin tə'min oldygy mejdana çьkar. At ilə nisbətən Saljan və Kyba kəzalarь jaxşь tə'min olynmyşlar; Qəjçaj kəzasь, Daglьk Karabag və Naxçьvan Cumhyrijjəti isə az tə'min olynmyşlar. Kojyn orta tə'minliqdən (732) artьk Agdam, Cəbrajьl, Zakatala, Şəqi və Kazax kəzalarьnda, orta tə'minliqdən aşagь—Baqь, Qəjçaj, Qurdustan, Lənqəran kəzalarilə Daglьk Karabag əjalətində mevcyddyr. Byjnyzly iri kara-mal ilə nisbətən jakşь tə'min olynmyş Agdam, Zakatala və Kazax kəzalarь; zəif tə'min olynmyş isə, Baqь, Lənqəran və Saljan kəzalarьdyr.

## 5. Qəntçi təsərrufatьnda maldarlьgъn roly.

Cumhyrijjətin maldarlьgь qənt təsərrufat hejvanlarьnьn on nev'i ilə: iri byjnyzly mal, əquz, zeby, kojyn, qeçi, eşəq, katьr, dəvə və donyzla qifajətlənmişdur.

**Kojynçylyk**. Azərbajcanda kojynlarьn umymi mikdarьndan və bynlarla tə'min olynmakdan kojynçylygyn bəjuq əhəmijjəti olmasь qərulur; çunqu ilq nevbədə, kojynçylyk, təsərrufatьn istəhlaq ehtijacьnь sut, ət və jynla ədəjən bir mənbə' təşqil edir. Başlьca olarak qəçəri və jarьm qəçəri tipində olan kojynçylyk təsərrufatlarьnda isə, jyn və dəri qibi sənaje' xam mallarь mənbəi olmakla mal əhəmijjəti də vardyr.

Kojynçylyk uçun qeniş otlaklarьn mevcyd olmasь lazьmdyr. By barədə cumhyrijjətimizin çok mikdarda qeniş Alp otlaklarь olmakla, əlverişli şərtləri vardyr; by otlaklardan hələ bir çok illər başka qənt təsərrufat məksədi uçun istifadə olyna bilinməz.

Azərbajcanda saklanьlan kojynlar, butunluqlə cumhyrijjət daxilində jetişən olyb kyjrykly kojyn tipindəndur.

Ən çok iktisadi əhəmijjəti olan incə jynly merinos, kojynçylygymyzyn təqamuludur; çunqu bynyn sənaje'miz uçun bəjuq əhəmijjəti vardyr. Incə və jarьm incə tokymalarьn istehsalь uçun incə merinos və jarьm incə jyn lazьmdyr. Merinos kojynçylygy Azərbajcana Rysjadan qeçmiş və Qəncə kəzasьnьn qərb hissəsi rajonynda məhqəmləşmişdur (sabik Şamxor kəzasь dajirəsində). Byrada 150,000 baş merinos kojyny var idi. Merinoslarьn jetişdirildiqi başlьca mərqəz (xəritəjə bakьnьz): Slavjanka, Çardaklь, Movo—gorelovka, Novo—Siosovka, Novo—Saratovka və başka qəntlərdur. Merinos kojynçylygyny cumhyrijjətimizdə ilq aparan malaganlar olmyş və bynlardan merinoslar turqlərə və ermənilərə qeç-

mişdur. Hali-hazьrda merinos kojynlarьnьn mikdarь 6—8 minə kədər azalmьşdyr və qet-qedə tərəkki etməq dejil, tənəzzul etməqdədur. By tənəzzulun səbəbi başlьca olarak, kojynlarьn oldygy rajonda boş otlak jerlərinin olmamasьdyr. Hal by qi, cumhyrijjətimizin merinos kojynlarьnь butun il ot ilə bəsləməq imqanь verən çok əlverişli iklim şərtləri vardyr; by da şubhəsiz, jynyn ycyzlanmasьna tə'sir edə bilər. By hal, Azərbajcanda merinos kojynlarьnьn jajьlmasьna qeniş planlar açьr. Laqin bynyn uçun bir şərt lazьmdyr qi, o da kojynçylara yjgyn otlak jerləri verilməsi məsələsini duzqun həll etməqdən ibarətdir. Qəntçi uçun merinos kojynlarь ilə məşgyl olmanьn fajdalь olmasь aşagьdaqь rəkəmlərdən qərulur: kaba jynly kojyn „zozax" iqi dəfə kьrxьldьkda, orta hesab ilə 1,6 qilograma kədər jyn verir qi, bynyn qilogramь ancak 61—73 kəpəqə satьlьr; merinos isə qilogramь 2 manat 20 kəpiq-2 manat 40 kəpiqə qedən 6—8 qilogram jyn verir. Azərbajcan Şyra Cumhyrijjətinin toprak Komisarlьgь Qəncə jakьnlьgьnda Slavjanka qəndində, qiçiq bir merinos kojynlarь dəlluqu təşqil etmişdur.

**Byjnyzly iri kara-mal.** Ölqəmizin qənt əhalisində təsaduf etdiqimiz byjnyzly iri kara-mal nev'ləri: byga, əquz, inəq, qəl, camyş və zebydan ibarətdur. Iri byjnyzly kara-mal ancak əqinçilik məksədinə xidmət edib muxtəlif çəl işləri və nəklijjat uçun vahib bir işçi kuvvəsi təşqil edir.

By kara-mal, ətliq-işçi tipidur və iqi cinsə ajrьlьr: baş Kafkas daglarь ətəqlərində və Qur çajьnьn sol sahilində jaşajan bəjuq Kafkas cinsi və Qiçiq Kafkasьn təpəliqləri ilə Qur çajьnьn Arasa koşylana kədər sag qənarь duzluqunda jaşajan Qiçiq Kafkas cinsidur. Bəjuq Kafkas cinsi nisbətən xьrda olyr: by cinsə mənsyb olan inəqlərin əti 50 qilogramdan—100 qilograma kədər olyr. Qiçiq Kafkas cinsi umymijjətlə bəjuq Kafkas cinsinə nisbətən iri olyb, əti bə'zən 120—200 qilogram olyr. By cins sutlu və ətli olyr. Xusysən Karabag və Kazax kara-malь jaxşь hesab olynyr. Rysja Avropasь cinsindən Azərbajcan Şyra Cumhyrijjətində, kolonistlər tərəfindən (alman və sektantlar) byraja qətirilmiş, çərqəs, kalmьk və alman cinslərinə təsaduf etməq olyr.

Lənqəran kəzasьnda jarьm qəçəri halьnda jaşajan maldarlar məhəllində „qiləq" dejilən zeby saklarlar; bynyn nisbətən yzyn byjnyzlarь və byjnyzynyn kabak tərəfində bir donkasь var. Donkanьn bəjuqluqu 2 qilogram mikdarьndadyr.

Qiləqin bojy iri, bədəninin şəqli qəjçəq və kuvvəsi çokdyr; sutu isə çok dəjildur. Əquzlər əqsərijjətlə aranda çokdyr. Bynlarьn kuvvəsi çok olyb yzyn muddət və mutəsavi işlərlər. Cumhyrijjətin butun məhəlli cinslərinin və nev' curlərinin xusysijjəti, bojlarьnьn qiçiq olmasьndadyr; çunqu jem azlьgь, qafi kədər kyllyk olynmamasь, tez bir vaktda ciftləşmə və sun'i seçmənin joklygy Azərbajcanьn butun dajirələrinə məxsysdyr. Məhəlli inəq çok az; orta hesab ilə ildə 30—45 vedrə sut verir. Bir qilogram jag 25—30 qilogram sutdən alьna bilər; sut təsərrufatьnьn mərqəzi, başlьca alman kolonijalarьdyr. Başka jerlərdə jag dytmak və pəndir qəsməq işləri məhəlli ehtijacь başlьca olarak, şəhərlərin ehtijacьnь ədəjən mikdardan bir az çok mikjasda jajьlmьşdyr.



Azərbajcanda sutçuluq işinin qələcəqi çok parlakdyr; çunqu cumhyrijjətimizin cografi və iklimi şərtləri sut verən kara-malьn saklanьlmasьna yjgyndyr.

**Atçьlьk.** Azərbajcan maldarlьgьnda atьn mikdarь çok azdyr. Byna səbəb cumhyrijjətimizdə jerli əhali uçun işçi kuvvəsinin əquz və qəllərdən ibarət olmasьdyr. Çok pis halda bylynan araba jollarь və qəhnəlmiş əqin alətləri at kuvvəsi işlətməqə jaramajьr. Atь ancak, araba jollarь olmajan və ja ilin hər vaktьnda araba hərəqatinin mumqun olmadьgь jerlərdə juq uçun saklarlar. By cur jerlər əlqənin sojyk dag hissəsindədur. By jerlərdə şejləri juq halьnda daşьmak məcbyrijjəti oldygy uçun, kədim zamandan biri juq daşьmak sənəti qibi bir sənət əmələ qəlmişdur qi, bynynla ancak „çarvadarlar" məşgyl olyrlar (Şamaxь və Qəjçaj kəzalarьnda).

Jakьn zamanlara kədər Azərbajcan bir çok kijmətli-jerli at cinslərilə məşhyr idi. Bynlardan ən çok kijmətlisi Karabag miniq atьdyr. Laqin ejni-zamanda Kyba, malagan və dliboz atь da şajani-dikkətdur. Nisbətən az mikdarda alman və rys qəntçilərində koşylan atlara təsaduf olynyr. Jerli at davamlь və hər cur jemə dəzən olyr; umymijjətlə Azərbajcanda qəntçi atь jaxşь cinsdən dəjildur. Sun'i seçmə joklygy, jerli cinslərin kьrьlьb jok olmasьna və cьrlanmasьna jardьm edir. Byna qərə də həqumətimizin Azərbajcan atçьlьgьnьn jakşьlaşdьrьlmasь jolynda olan kajgьlarьndan birisi də, tərədici cins atlar əldə edib ciftləşdirmə mintəkələri kyrmakdan ibarətdur.

## 6. Azərbajcan qənt təsərrufatьnьn umymi məhsylatьnda maldarlьgьn dytdygy jer.

1913-cu ildə 138.611 min (muharəbədən əvvəlqi) ryblə məbləgində olan qənt təsərrufatьnьn umymi məhsylatьndan maldarlьgьn pajьna 18,1% və by cumlədən ət məhsylatьna 7,8%, sut məhsylatьna 8,5%, qənə 1,1% və jyna 0,7% duşur. 1926/27-ci ildə aşagьdaqь rəkəmlər əldə edilmişdur: Qənt təsərrufatьnьn umymi məhsylatь muharəbədən əvvəlqi kijmətlə 136.693-min ryblə olyb, byndan maldarlьgьn pajьna 16,9% duşur: by axьrьncь rəkəm dəxi bələ təksim olynyr: ət məhsylatь 6%, sut məhsylatь 8,0%, dəri 2,3%, jyn 0,6%.

## V.UZUMÇULUQ VƏ ŞARABÇЬLЬK.

### 1. Azərbajcan Şyra Cumhyrijjətində uzumçuluǥun umymi sahəsi.

Cumhyrijjətimizdə uzumçuluǥun dytdygy sahə: 26.000 heqtar bəjuqluǥundədur qi, by da Azərbajcandaqь baglarьn sahəsьnə nisbətən 80,0%, butun jarar toprak sahəsinə nisbətən isə 0,4% təşqil edir. 26,000 rəkəmi təxmini olarak ǥəturulmuşdur; çunqu by barədə 20 ildən jykarьdyr qi heç bir tədkikat aparьlmamьş və byna ǥərə də Cumhyrijjətimizdə uzumçuluǥun dytdygy umymi sahə mikdarь hali-hazьrda muəjjən edilməmişdur; toprak və malijjə komisarlьklarьnda olan mə'lymat isə muxtəlif olyb, təxminən 26721,5 və 28885 heqtar arasьnda ojnajьr.

By 26721,5 heqtar mikdarьnda umymi sahə, Şyra Azərbajcanь inzibati vahidləri arasьnda bəjlə bəlunur:

| | | | |
|---|---|---|---|
| Agdam kezasь | 2725,0 heqtar: | Baqь „ | 3815,0 heqtar |
| Ǥəncə „ | 2000,2 „ | Şamaxь „ | 2180,0 „ |
| Şamxor „ | 1863,9 „ | Saljan „ | 545,0 „ |
| Kazax „ | 1318,9 „ | Lənqəran „ | 534,1 „ |
| Agdaş „ | 1389,8 „ | Kyba „ | 392,4 „ |
| Şəqi „ | 632,2 „ | Naxçьvan Cumhyrijjəti | 899,3 „ |
| Zakatala „ | 904,7 „ | Daglьk Karabag | 3488,0 „ |
| Ǥəjçaj „ | 4033,0 „ | | |

### 2. Uzumun məhsyly jьgьlmasь və şarab çəqilməsi.

Azərbajcanda uzumçuluq və şərabçьlьk, az mikdarda olan mədəni mintəkələr (Ǥəncə və Kazax kəzalarьndaqь alman kolonijalarь) istisana olmak uzrə çok ibtidai bir haldadyr. Çok vəkt uzumu ajak ilə taxta tabaklarda tapdalajьrlar. Uzum şirəsi tempratyry çok dəjişiǥliǥə ygrajan kablarda kьzkьrdьlьr. Uzumçuluq texnikasь çok ibtidai bir halda oldygy uçun, məhsyly da az olyr, dajirəsindən asьlь olarak jerli uzumliqlərdə bir heqtardan 1638-dən 4914-qilograma kədər uzum, təsərrufatь mədəni bir halda bylynan əqilişi duzǥun, ǥubrələnməsi qafi və sylanmasь artьk olan Alman kolonijalarьnda isə 13104 qilogramdan 19656 qilograma kədər uzum hasьl olyr. Bynynla barabar Ǥəncə rajonynyn Şyra həqumət təsərrufatlarьnda uzumçuluqun daha mədəni bir usyl ilə aparьlmasь və çok məhsyl verən tənəq cinslərinin seçilib əqilməsi sajəsində uzum məhsyly il-ildən sur'ətlə artmadadyr.

| | | | | | | |
|---|---|---|---|---|---|---|
| 1920-ci | ildə | uzum | məhsyly | 13115 | sentner | olmyşdyr |
| 1921 „ | „ | „ | „ | 19672 | „ | olmyşdyr |
| 1922 „ | „ | „ | „ | 24590 | „ | „ |
| 1923 „ | „ | „ | „ | 22951 | „ | „ |
| 1924 „ | „ | „ | „ | 39343 | „ | „ |
| 1925 „ | „ | „ | „ | 32787 | „ | „ |



Azərbajcanda muharəbədən kabak illər jьgьlan uzum, orta hesab ilə altь juz min tona musavi idi. Şyra həqumətində isə jьgьlan uzum və çeqilən şarab by kərar ilədur:

| | Toplanьlan sentner ilə | Şarab çəqilməsi min vedrə ilə |
|---|---|---|
| 1924-ci il | 893.444 | 3140 |
| 1925 „ „ | 693.115 | 2778 |
| 1926 „ „ | 532.787 | 2050 |
| 1927 „ „ | 655.738 | 2620. |

Hələ by vakta kədər jьgьlan uzum mikdarь muharəbədən əvvəlqi mikdara çatmamьşdyr. Çunqu 1000 heqtara kədər uzumluq sahьbsьz xaraba bir bir halda kalmakdadyr (başlьca Şamaxь kəzasьnьn daglьk hissəsində, Mədrəsə, Qərǥəncə, Sagjan, Ǥurcuvan ǥəndləri). Əldə edilən uzum məhsylyndan 15% cumhyrijjət daxilində uzum halьnda işlədilir (jejilir); çok az bir hissəsi doşab hazьrlanmasьna sərf olynyr; jerdə kalan uzumdən isə şarab hazьrlanьr. Bazara ən çok jeməli uzum çьkaran Apşeron qəntləri-Məştaga, Pirşagь, Şuvəlan, Nardaran və başka qəntləri, və Ǥəncə rajonydyr. Ǥəncə rajony „təbrizi„ dejilən uzumu satьşa bьrakьr və by cinsin çok hissəsi (60%) Ǥəncə rajonyndan Rysjaja, Baqьja və Tiflisə ǥundərilir.

Cumhyrijjətimizdə hazьrlanan şarab başlьca kyry[1]) olyb ancak 10%-i şirin olyr. Şirin şarab ən çok Ǥəncə, Şamxor və Qurdəmir rajonlarьnda hazьrlanьb, başlьca olarak Rysjaja ǥəndərilir. Umymijjətlə butun şarabьn 45%-i cumhyrijjət xaricinə çьkarьlьb jerdə kalan hissəsi Azərbajcan daxilində işlədilir və spirt çeqirlər.

### 3. Şarabçьlьk ilə əlakədə olan istehsalatlar.

Bag uzumçuluǥunun başlьca məhsyly olan şarabdan başka, şarabçьlar uçun az-çok əhəmijjəti olan başka məhsyllarь da vardyr. Azərbajcanda by ǥəməqçi məhsyllar cumləsinə: şarab distilesi, sirqə və abkyra istehsalь daxildur. Uzumu başlьca olarak, şarab jaxşь satьlmadьgь, vaktlь-vaktьnda uzum jetişmədiǥi, by və ja başka xəstəliǥlərdən uzum xərab oldygy ittifaklarda distilə edərlər. Jalnьz mustəsna ittifaklarda, məsələn, şarab satьşь az olyb jaz vaktьna tyrşyjar və bylanarsa, o zaman şarabdan spirt çəqilir. Umymijjətlə şarabçьlьkdan kalan butun materjaldan (cecə-pьçal, maja və iləx.), cumhyrijjətin butun rajonlarьnda xam spirt (uzum aragь) çeqilir. Byny, şarabşьlьk ilə məşgyl olan hər bir qəntdə bir neçə mikdarda mevyd olan odly şarab distiləsi zavodlarьnda (sadəcə qiçiq distile kazanlarь — mejlər ilə) çəqirlər. By xam spirt isə byndan 94 — 96 dərəcəli təmizlənmiş uzum spirti almak

1) Şarab kyry, şirin,xorəq şarablarь qibi adlar, onlarьn tərqibində olan spirt və şəqərin mikdarьna ǥərə verilir. Byrada „kyry" qəlmesi adi kyry səzu ilə karьşdьrьlmamalьdyr. **Redaksija.**

uçun, rektifikasija zavodlarьna verilir və kismən, cecə aragь adilə satьşa bьrakьlьr.

Cumhyrijjət daxilində təmizlənmiş uzum spirti və konjak spirti aşagьdaqь mikdarda hazьrlanьr (min dərəcələr ilə ƣestərilir.

| | Uzum spirti | Konjak spirti | Tyt spirti. |
|---|---|---|---|
| 1925-ci il | 10075 | 3065 | 3012 |
| 1926 „ „ | 9132 | 4559 | 3265 |
| 1927 „ „ | 15462 | 1156 | 4239 |

(By cədvəldə tyt spirti istehsalь dəxi ƣestərilmişdur).

Tyt spirtindən ancak arag hazьrlanьr (Agdam kəzasьnda və Daglьk Karabagda). By arak jerli bazarda işlədilib, Azərbajcan daxilində işlədilən aragьn umymi mikdarьnьn 33%-ni təşqil edir. Aragьn jerdə kalan mikdarь isə uzum spirtindən və Ƣurcustandan ƣetirilən çərəq spirtindən hazьrlanьr.

Azərbajcanda istehsal olyanan butun uzum spirtinin 20 %-i başlьca olarak Rysja Şyralar Cumhyrijjətinə ƣendərilir. Jerdə kalan mikdar isə, Baqь bazarьnda uzum aragь hazьrlanmasьna sərf olynyb, kismən dəxi şarabçьlьk təsərrufatlarьnda uzum çaxьrlarьnьn kuvvətləndirilməsinə işlədilir. 1927-ci ildə çaxьrьn kuvvətləndirilməsinə 3-miljon dərəcə spirt sərf olynmyşdyr. Cumhyrijjətdə 10-konjak zavody vardyr; biri Azərbajcan şarab trestinin (Azvin-Azşarab) dur; o biriləri isə aşagьdaqь kooperatiflər arasьnda bəlunmuşdur:

„Konkordija" — 4 zavod; „Kolokol" — 2; „Bagçьlar ymydy", „Ƣəncə şarabь" (Ƣəncvin), və „Loza„ („təhənq.) birər zavod. Rektifikasija (təmizləjici) zavodlarь altьdyr:

| | | |
|---|---|---|
| Azvinin . . . . . . . . . . . . . . . . . | 1 | zavody vardyr. |
| Konkordijanьn . . . . . . . . . . . . . . | 3 | „ „ |
| Lozanьn . . . . . . . . . . . . . . . . . | 1 | „ „ |
| Bagçlar ymydynyn . . . . . . . . . . . . | 1 | „ „ |

Ən kuvvətli konjak və rektifikasija zavodlarь Konkordijanьnqьlardyr.

Uzum sirqəsi, hər bir bag sahьbqarь tərəfindən ja şarab kьzkьrmaga başlarqan şarabdan və ja sun'i olarak şarabçьlьk kalkьsьndan: cecədən, xarab olmyş uzumdən və iləx.. dən hazьrlanьr. By sirqə jalьnьz xusysi (şəxsi) ehtijac uçun hazьrlanьb, az mikdarda bəjuq şəhərlərdə satьşa bьrakьlьr.

Abkora, sirqənin bir nev'i olyb koradan çeqilir; bynyn təmi ləzzətli olyb, çəşni olarak xərəqə katьlьr.



### 4. Azərbajcan Şyra cumhyrijjətində uzumçuluq və şarabçьlьk rajonlarь.

Azərbajcanda dərt şarabçьlьk və uzumçuluq rajony: 1) Ƣəncə-Şamxor, 2) Şirvan, 3) Karabag və 4) Apşeron rajony vardyr. By rajonlardan ən əhəmijjətlisi Azərbajcanda hasьl olan şarabьn 2/3 hissəsini hazьrlajan Ƣəncə—Şamxor—Kazax rajony (gərb rajony) dyr. By rajon çok məhsyl verməsi ilə məşhyrdyr. Rajonda şarabçьlьk ilə ancak kolonija almanlarь və ermənilər məşgyldyrlar, uzum məhsylynyn şarabçьlьga jalьnьz 50%-i sərf olynyr. By rajonda spirt çeqməq, doşab pişirməq artьk dərəcədə jajьlьb jeməq uçun də ən ləzzətli olan bir cins uzum („təbrizi") becərilir.

Şarabçьlьkda iqinci jeri Ƣəjçaj və Şamaxь kəzalarь daxil olmakla, Şirvan rajony dytyr. By rajona xusysilə 1918-1920-ci illərdə erməni-turq tokyşmasь zamanь çok zərər dəjmişdur, by tokyşma nəticəsində ermənilərə məxsys olan bir çok uzumluqlər tələf olmyşdyr. Tənəqləri agaclara sьrmaşmьş turq uzum baglarь, çok aşagь dərəcədə bir jer dytmadadyr. Turqlər istər şarabçьlьk, istərsə spirt çeqməq ilə məşgyl olmajьrlar. Bynynla ermənilər məşgylolyrlar. By rajonda „karaşirə" dejilən uzum cinsi hasьl olyr qi „kabernə" dejilən məşhyr Fransa uzum cinsindən ƣeridə kalmajьr. Uçuncu, Karabg rajonynyn başlьca olarak şarab distiləsi uçun əhəmijjəti vardyr. By rajon dəxi erməni-turq tokyşmasьndan zərər çeqmişdur; laqin Şirvan rajonyndan fərkli olarak, byrada uzumluqlər tələf edilməmiş, ancak kyllyksyz kalmьşdyr. Dərduncu rajon—Apşeron rajony ancak turq rajony olyb, şarabçьlьk ilə heç əlakəsi jokdyr. By rajonda ƣunəş istiliqinin çok olmasьndan və sun'i syvarmanьn meveyd olmamasьndan ən ƣezəl jeməli uzum cinsləri—şani jetişir. By uzumlər çok şirin olyb, ejni zamanda çok zərif oldyklarьndan, başka jerlərə ƣendərilməsi çətindur və byna ƣərə də hamьsь jetişdiqi rajonda işlədilir.

### 5. Uzumçuluq qulturu.

Azərbajcanda uzum muxtəlif nev'lər ilə jetişdirilir; tənəqlər mejnələr sirmaşьcь, diq və jerə jatan şəqldə olyr. Azərbajcanda 26000 heqtar bəjuqluqundə olan uzumluq sahəsinin daha mədəni sajьlan kьsa ƣəjdəli tənəqlər pajьna 11000 heqtar duşur. Jerdə kalan 15000 heqtər isə agaclara sirmaşmьş tənəqlər pajьna duşur (xijabani).

Azərbajcanda ən mədəni sajьlan Ƣəncə—Şamxor rajonynda tənəqlər əqməq uçun, jeri biri-birinə paralel sьralarla plantazlaşdьrьb ƣubrələjirlərə; tənəqləri ja pajalara və ja iqi paja arasьna çeqilmiş maftyllara baglajьrlar. Byrada məhsyl xusysən syvarma işi lazьmi kədər jaxşь aparьldьkda çok bol olyr. Alman uzumçuləri kooperatifi „Konkordija" fəalijjətinin bəjuq bir mədəni tə'siri vardyr. Şirvan rajonyndə, aran hissəsində, turq əhalisi uzum tənəqlə-

lərini agaclara sьrmaşdьrmak usylilə jetişdirirlər. Daglьk hissədə ermənilər tənəqləri kьssa qol şəqlində becərib өzləri məaləcə edir və өzləri də şarab kajьrьrlar.

Karabag rajonynda texniqi şərtlər az-çok Şirvan rajonyna bənzəjir.

Apşeron jarьm adasьnda iklim şərtlərindən asьlь olarak, jetişdirilən uzum tənəqləri jerə jatьr.

Cumhyrijjət daxilində jetişdirilən uzum cinslərinin mikdarь şokdyr; laqin bir rajona məxsys olarak jetişən uzum cinsi mikdarь azdyr. Butun uzum cinsləri iqi əsas grypa ajrьlьr: jeməli və şarab uzumu gryplarь. Turq əhalisinin çok oldygy rajonlarda uzumun jeməli cinsləri jetişdirilir. Məsələn Ƣəncə—Şamxor rajonynda „təbrizi", Apşeronda „şani" uzumləri.

Azərbajcanda kьrmьzь çaxьr uçun ən jaxşь cins hesab olynan „kara şireji" uzumdur. Almanlar byna „matras" dejirlər, by uzumun vətəni Şirvan rajonydyr; ag çaxьr uçun Alman „ryndvejs" cinsi çok məhsyl verən olyr.

## 6. Şyra Azərbajcanьn istehsalatçь uzum - şarab kooperatifləri və devlət Şyra təsərrufatlarь.

Cumhyrijjətdə mevcyd olan 26000 heqtarlьk umymi uzumluq sahəsinin 7000 heqtarь, jə'ni mədəni syrətdə jetişdirilən uzumluƣun 27%-i kooperatifləşdirilmişdur.

Hali-hazьrda aşagьdaqь kooperatiflər fəalijjətdədurlər:

1) 1920-ci ildən „Konkordija" (Ƣəncə və Kazax kəzalarь).
2) 1926-cь ildən „Loza" (Ƣөjçaj kəzasь və Qurdəmir stansijasь).
3) 1921-ci ildən „Kolokol" (Şamaxь kəzasь)
4) 1927-ci ildən „Bagçьlar ymydy" (Agdam kəzasь).
5) 1927-ci ildən „Ƣəncəvin" (Ƣəncə şəhəri).
6) 1928-ci ildən „Kax" (Zakatala kəzasь).
7) 1928-ci ildən „Karvinkoop" (Daglьk Karabag).

Azərbajcanda uzumçuluƣ məhsylyny hazьrlajan jalnьz uzum-şarab kooperasijasьdyr. İstər өzu, istərəsə həqumət uçun mal hazьrlamak işləri kooperasija tərəfindən aparьlьr; uzum tədaruqundə xusysi şəxslər heç bir rol ojnamajьrlar. Kooperativlərin şarablarь muhafəzə etməq uçun zirzəminləri (padvallarь) vardyr. By zirzəminlərin dytarь by kərar ilədir: „Konkordija" 560-min vedrəliq; „Loza"—120 min vedrəliq və „Bagçьlar ymydy"—25 min vedrəliq.

Azərbajcan şarab-spirt tresti „Azvinin" maddi əsasьnь təşqil edən devlət şyra təsərrufatlarь ancak istehsalat karakterini daşьjьb, byrada butun dikkət uzumçuluq və şarabçьlьga verilmişdur.

„Azvin" trestinin 8 şyra təsərrufatьnьn uzumluq sahəsi: 400 heqtarlьk uzum verən, 56-heqtarlьk bərpa olynan və 25-heqtarlьk tə'sis olynmyş Amerika ana pəhrənliƣi sahələrindən ibarətdur.



Butun şyra təsərrufatь zirzəmilərinin dytarь—840 min vedrəliq dur. Şyra təsərrufatlarь Ƣəncə-Şamxor rajonynda vardyr.

## 7. Şarabçьlьk və uzumçuluƣə dajir tədbirlər.

Uzumçuluq uçun ən korkyly olan fəlaqətlərdən birisi—f i l o k s e r a d u r. Bynyn zuhyr etməsi uzumluƣun tələf olmaga başlaması dIməqdur. Hələliq ancak Kazax kəzasьnda ƣөrulmuş flokseranьn dytdygy sahə 16,5-heqtara musavidur. Filoksera, ƣөzə ƣөrunən quçuq bir bitdur. Bynlar bөjuq kolonijalar ilə qeqlərin incə kismlərində saqin olyb, tənəƣin şirəsini soryr və by syrətlə tənəqi javaş-javaş kyrydyrlar. Tənəq xəstələnir, japraklarь qiçilib saralьr; uzum salkьmlarь quçulur; ildən-ilə uzum məhsyly azalьr və 5 - 6 ilin içərisində tənəq busbutun kyryjyb həmişəliq tələf olyb ƣedir. Filoksera ilə ən jaxşь mubarəsə usyly—umymijjətlə kəbyl edilmiş mədəni mubarəzə usylydyr qi, by da tənəqlərimizi javaş-javaş filokseraja karşь dəvamlь olan Amerika nev'inə çevirməqdur. By ittifaklarda jerli tənəqlər əvvəlcə Amerika tənəqlərinə aşьlanьr, və byndan sonra bynlarь əqirlər; by syrətlə jetişmiş uzum, jerli uzum olyr, qeq isə filokseraja karşь dəvamlь olan Amerika tənəqinin qequ ojyr. Azərbajcanda hali-hazьrda filoksera ilə mubarəzə etməq uçun, toprak daxilinə az mikdarda qyqyrtlu karbon bьrakьrlar By usyl filokseraja dytylmyş uzumluƣun məhsylyny azaltmamak jolynda jaxşь nəticələr vermişdur.

Amerika tənəqlərinin ana pөhrənliƣinə (fidanlьgьna) Annenfeld kolonijasьnda (Şamxor kəzasь), 27-heqtar, „Xaraba-jeri" şyra təsərrufatьnda da 27 heqtar jer ajrьlmьşdyr. 1927-ci ildə Annenfelddə Amerika tənəqi pөhərənliƣinə 3-heqtar jer ajrьlьb əqilmişdur. By tənəqlər Fransa və Avstrijadan ƣetirilmişdur. 1927-ci ildə 300-min dənə tənəq aşьlanmьşdyr. „Xaraba-jeri" şyra təsərrufatьnda 1926-ci ildə 8 heqtar jerə tənəq basdьrьlmьşdyr; 1927-ci ildə isə by sahə 25- heqtara kədər artьrьlmьşyr. Byndan başka Lənqaran kəzasьnda „Sara" adasьnda, dezenfeksija pөhrənliƣi adlanan qiçiq bir Amerika tənəqi pөhrənliƣi vardyr.

1923-ci ildə Baqьda enoqimija (şarabь analiz edən) labaratorijasь tə'sis olynmyşdyr. Bynyn məksədi, şəhər bazarlarьna çьkarьlan şarab-spirt məhsylatьnь analiz edib, şarabьn saxtaıanmasilə mubarəzə etməqdur. Byndan başka by labaratorija ilq dəfə olarak Azərbajcanda 1927-ci ildə jerli şarablarь jaxşьlaşdьrmak məksədilə şarabçьlar arasьna jajmak uçun maja tədaruq etməƣə başlamьşdyr. Hali-hazьrda labaratorijanьn ixtijarьnda 25-dən jykarь təcribə edilmiş əcnəbi, Kьrьm, Kaxetin cins təmiz maja qulturu vardyr. By majalar cumhyrijjət xaricinə dəxi çьkarьlьr.

### 8. Şyra Azərbajcanьnьn umymi milli mədaxilində uzumçuluƣun roly.

Uzumluƣun dytdygy sahə orta hesab ilə ildə 6-7-miljon çervon ryblə kijmətində 819.672 sentner uzum verir. Uzum arak-konjak istehsalatь 1925/26 ci ildə 11 miljon ryblə vermişdur. By syrətlə butun hasьl olan uzumun gejri-saf hasьlat dəjəri Şyra Azərbajcanь umymi milli mədaxilinin 7%-ini təşqil edir. Jykarьda ƣɵstərdiƣimiz uzum rajonlarьnьn jeƣanə mədaxil jeri uzum baglarьdyr.

## VI. BAGÇЬLЬK-BOSTANÇЬLЬK.

Azərbajcanda umym bag-bostanьn dytdygy sahə 32,6 min heqtar (29,9 min desetin) mikdarьnda olyb, jarar topragьn umymi sahəsinin 0,5%-ni təşqil edir. By 32,6 min heqtarlьk sahə by cur bɵlunur:

| | | | |
|---|---|---|---|
| Bag | 20,6 | min | hektar |
| Bostan | 7,0 | „ | „ |
| Bagça | 5,0 | „ | „ |

By 32,6 min heqtarlьk umymi sahə, kəzalar arasьnda belə bɵlunur:

| | | | | | | | |
|---|---|---|---|---|---|---|---|
| 1. Kyba kəzasь | 13,2 | min | heqtar | 10. Kazax | 0,5 | min | heqtar |
| 2. Zakatala „ | 5,5 | „ | „ | 11. Şamxor | 0,5 | „ | „ |
| 3. Agdam „ | 3,3 | „ | „ | 12. Şamaxь | 0,5 | „ | „ |
| 4. Naxçьvan Cumh. | 2,5 | „ | „ | 13. Lənqəran | 0,4 | „ | „ |
| 5. Ƣəncə kəzasь | 2,2 | „ | „ | 14. Baqь | 0,2 | „ | „ |
| 6. Şəqi „ | 1,1 | „ | „ | 15. Cəbrajьl | 0,2 | „ | „ |
| 7. Daglьk Karabag | 1,0 | „ | „ | 16. Saljan | 0,2 | „ | „ |
| 8. Agdaş kəzasь | 0,5 | „ | „ | 17. Qurdustan | . . . . . . . | | |
| 9. Ƣɵjçaj „ | 0,5 | „ | „ | | | | |

By cədvələ dikkət etdiqdə, ən çok bag olan jer Kyba kəzasьnьn oldygyny ƣɵruruq. By kəzanьn bə'zi rajonlarьnda bagçьlьk hətta əhalinin başlьca məşgylijjətini təşqil edir. Kyba kəzasьnьn daglьk hissəsində birinci jeri alma və armьd agaclarь dytyr; o biri agaclarьn roly byrada çok azdyr. Aran hissəsində əriq, şaftalь, nar, əncir və iləx.. agaclara təsaduf olynyr. Vladikavkaz dəmir jolyna jakьn olmak və mejvələrin də jaxşь olmasь sajəsində Kyba kəzasьnьn mejvələri bir Baqь dəjil, Şimali Kafkaza və hətta Moskva və Leningrada ƣɵndərilir.

Azərbajcanьn başka bagçьlьk rajonlarьnda Şəqi kəzasьnь kejd etməq lazьmdyr. Byrada ən çok olan agac koz agaclarьdyr. By agaclarьn mejvələri Baqь, Ƣəncə, Moskva, Rostof, Xarkof və Rysja ilə Ykrajnanьn başka şəhərlərinə ixrac olynyr. Cədvəldən ƣɵrulur qi, bagçьlьk və bostançьlьk butun Azərbajcanda jajьlmьş və yzak zamandan bəri mevcyddyr; baglara hər jerdə istər aran istərsə daglьk hissələrdə təsaduf olynyr. Baglarьn çoky aran rajonlarьnda, az kьsmь isə daglьk kьsьmlarda olyr. Aran jerlərdə bag və bostan 50%, hundur jerlərdə isə 41% vardyr. Cumhyrijjətimizdə muxtəlif mejvələr və səbzəvat: alma, armьd, ƣavalь, hejva, albalь, əriq, şaftalь, əncir, nar, koz, şabalьt, əzƣil (myşmyla), tyt, ƣilas, moryg, rys uzumu, bɵjurtqən, pamador, badьmcan, qɵq, kartof, sogan, fasolja, qələm, karpyz, kavyn, balkabak və iləx.. olyr. Əqsərijjətlə mejvələrin jerli cinsləri və çok vəkt Avropa cinslərindən ƣəri kalmajan mejvələr jetişdirilir (şaftalь). Avropa cinsləri də Azərbajcanda jaxşь jetişir (kalvil, ranet almalarь, duşes armьdь). Laqin ƣɵzəl şərtlərə bakmajarak (isti iklim, əlverişli toprak şərtləri və mejvəçiliƣin byrada kədim zamandan mevcyd olmasь) bagçьlьk və bostançьlьk çok aşagь dərəcədədur. Baglarьn mualəcəsi əhalijə az mə'lymdyr. Əhali sadə usyl ilə mejvələri jьgьb saklajьrlar və byna ƣɵrə də agaclar qorlyk çəqib məhsyl dəxi tələf olyr. Mejvələr və umymijjətlə mejvəçiliq məhsylatь ən çok ɵz məhəllində işlədilir. Azərbajcan xaricinə, nisbətən az bir kьsmь çьkarьlьr. Bagçьlьk rajonlarьnda mejvələrin satьlmasь usyly, başlьca olarak, dag qəndlərinə və jajlaklara juq ilə aparьlьb muxtəlif qənt təsərrufatь məhsylatьna dəjişməqdən ibarətdur. Şəhərlərə isə az bir kьsmь çьkarьlьr. Hal by qi, cumhyrijjətin xusysən mejvə rajony hesab olynan Kyba, Zakatala Ƣəncə kəzalarь və Naxçьvan Cumhyrijjəti jaş mejvələr (və kismən səbzəvat)in umymi istehsalatь cihətincə o kədər kuvvətlidur qi, nə inqi məhəllində, hətta umymijjətlə Azərbajcanda belə bynlarьn işlədilməsinə sɵz ola bilməz. Məhsyl, jalьnьz cumhyrijjət xaricinə mejvələrin çьkarьlmasilə satьlьb kyrtarar. Xaricə isə jalnьz almanьn bə'zi dəvamlь (çok saklanьla bilən) cinslərini çьkarmak mumqun ola bilir; jerdə kalan mejvə və səbzə isə kyrydylmyş və ja konserv halьnda çьkalan mejvə ... çьkarьlьb satьla bilir. 1924/25-ci ildə Azərittifak tərəfindən Kyba kəzasьnьn Xaçmaz stansijasьnda tiqilmiş səbzə-konserv fabriqini və Balaqən qəndində Zakatala qənt təsərrufat kredit cəmijjətinin qiçiq bir kyrydycy aparatьnь nəzərə almasak, cumhyrijjətdə az-çok babat bir fabriq və ja mejvə kyrydycy bir aparatьn mevcyd olmadьgьnь sɵjləjə biləriq. By muəssəsələr mejvəçiliq və bostançьlьgьn butun ehtijacьnь ɵdəmədiqlərindən, konserv fabriqləri və mejvə kyrydycy aparatlarьn bina olynmasь məsələsi birinci nevbədə dyran məsələlərdəndur. Cumhyrijjətimizin Ali Xalk Təsərrufat Şyrasьnьn ƣələcəq planьnda uç konserv zavodynyn (Xaçmaz, Ƣəncə və Lənqəranda) və uç mexaniqi mejvə kyrydycynyn (Kyba, Zakatala və Ƣəncədə) bina olynmasь və mejvə kalkьsьndan spirt çəqmə işləri alьnmьşdyr. Azərbajcan konserv və mejvə kyrytduzəltməq nəzərə alьnmьşdyr. Azərbajcan konserv və mejvə kyrytma sənajeinin umymi istehsalatьnь beş il içərisində 1926/27-ci ildə olan 68 min sentnerdən 1930/31-ci ildə 37-min sentnerə çatdьrmak ehtimal olynyr. Konservlərin başlьca olarak səbzə konservi olmasь, mejvələrin isə mexaniqi mejvə kyrydanlarda işlədil-

məsi dəxi ehtimal olynyr. Bagçьlьgьn by kьsa icmalьnь kyrtararak byny kejd etməq lazьmdyr qi, Azərbajcanda bir çok rajonlarьn qənt əhalisi budcəsində mejvəçiliq ƣɵrqəmli bir jer dytyr. Bostan bəcərməq və mejvəçiliq 1926/27-ci ildə qənt təsərrufatьnьn umymi məhsylynyn 7,4% vermişdur.

## VII. MEŞƏ TƏSƏRRUFATЬ

### 1. Dunja meşə sahəsində Şyralar Ittifakьnьn dytdygy jer.

Dunja meşə sahəsi təxmini hesabla 3-miljard heqtar jer dytyr qi, bynyn da başlьca hissəsi şimal jarьm qurəsinin mɵ'tədil kьsmьndadyr. Sosjalist Şyra Cumhyrijjətləri Ittifakьnьn dunja meşə sahəsində ojnadьgь rol aşagьdaqь mə'lymatdan aşqar olyr.

MUHUM ƟLQƏLƏRIN MEŞƏ SAHƏSI

| Ɵlqələrin adlarь. | Meşə sahəsi Miljon heqtar. | Ɵlqənin butun sahəsinə % nisbəti. |
|---|---|---|
| Şyralar Ittifakь Asja kьsmь . . . | 696 | 42,4 |
| Avropa kьsmь . . . . . . | 171 | 38,2 |
| Kanada . . . . . . . | 250 | 25,9 |
| Şimali Amerika Muttəhid Ştatlarь . . | 187 | 24,4 |
| Hindistan . . . . . . | 33 | .7,0 |
| Japonija . . . . . . . | 30 | 66,6 |
| Isvəç . . . . . . . | 24 | 57,0 |
| Finland . . . . . . . | 19 | 55,8 |
| Almanija . . . . . . | 13 | 26,3 |
| Fransa . . . . . . . | 10 | 18,2 |
| Norveç . . . . . . . | 7 | 22,0 |

By syrətlə ƣɵruruq qi, Şyralar Ittifakь ɵz meşə sahəsilə başka ɵlqələr arasьnda birinci jer dytyr; və by meşə sahəsi butun dunja meşə sahəsinin 28%-ni təşqil edir. Ɵz meşəliƣi ilə (meşələrin butun toprak sahəsinə olan prosentlə nisbəti) Şyralar Ittifakь birinciliƣi jalnьz Japonija, Isveç və Finlanda ƣuzəşt edir. Laqin bɵjuq meşə ɵlqələri arasьnda birinci jer dytyr. Şyralar Ittifakьnьn Asija hissəsi Avropa hissəsinə nisbətən daha çok meşəlidur (Sibir tajgasь)

### 2. Azərbajcanьn meşə sahəsi kəzalar arasьnda bɵlunməsi, meşəliq.

Azərbajcanьn umymi meşə sahəsi 1.247.700-heqtara musavi olyb, butun Şyralar Ittifakь meşə sahəsində 0,14%-ini təşqil edir.



Azərbajcan meşəliqlərinin cumhyrijjətin butun toprak sahəsinə (8572,3 min heqtar) prosent ilə nisbətini ƣɵtursəq 14% musavi, jə'ni butun Şyralar Ittifakьna nisbətən az meşəliƣə maliq olyr.

Ƣɵstərdiƣimiz cumhyrijjətin 1,247,700-heqtar umym meşə sahəsindən xalis meşə 840,100 heqtar və ja 770,700-desetindur.

By axьrьncь rəkəm kəzalar arasьnda by kərar ilə bɵlunur:

| | | meşəliq %-i. |
|---|---|---|
| 1. Lənqəran kezasь | 163,0-min heqtar | (19,4) |
| 2. Zakatala " | 119,5 " " | (14,3) |
| 3. Daglьk Karabag " | 81,8 " " | ( 9,7) |
| 4. Qurdustan kəzasь | 71,8 " " | ( 8,6) |
| 5. Ƣəncə " | 65,4 " " | ( 7,8) |
| 6. Şamxor " | 60,7 " " | ( 7,2) |
| 7. Agdaş " | 58,3 " " | ( 6,9) |
| 8. Kazax " | 44,5 " " | ( 5,3) |
| 9. Kyba " | 39,2 " " | ( 4,7) |
| 10. Şəqi " | 38,0 " " | ( 4,6) |
| 11. Ƣɵjçaj " | 31,5 " " | ( 3,6) |
| 12. Cəbrajьl " | 28,3 " " | ( 3,4) |
| 13. Baqь " | 19,5 " " | ( 2,3) |
| 14. Şamaxь " | 12,4 " " | ( 1,5) |
| 15. Agdam " | 4,3 " " | ( 0,6) |
| 16. Naxçьvan Cumhyrijjəti | 0,9 " " | ( 0,1) |
| 17. Saljan kəzasь | — — — | ( 0,0) |
| | Cəmi: 840,0 " " | (100) |

By syrətlə ən çok meşəliƣi olan Lənqəran kəzasь və ən az meşəliji olan Naxçьvan Cumhyrijjətidur. Saljan kəzasьnda isə heç meşə jokdyr.

### 3. Taxta tədaruqunun zəif inqişaf etməsi səbəbləri.

Cumhyrijjətimizin butun toprak sahəsini meşə ilə ɵrtulmuş hissəsilə dytyşdyrsak Azərbajcan meşə təsərrufatьnьn roly barəsində, bizdə əslindən artьk bir təsəvvurat əmələ ƣələ bilər. Hal by qi Şyra Azərbajcanьn meşəbəƣi ixtijarьnda olan butun dajirələrindən çьkarьlan taxta agac qiçiq rəkəmlərdə ƣɵstərilir:

| | | | |
|---|---|---|---|
| 1920-ci il . . | 429.244-kyb metro | 1923 24-ci il . | 518.620-kybmetro |
| 1921-ci " . . | 893.186 " " | 1924/25 . . . | 559.360 " " |
| 1922 " . . . | 242.044 " " | 1925/26 " " . | 569,681 " " |

1925/26-cь ildə butun Azərbajcanda meşələrdən 469.347 ryblə ƣəlir olmyşdyr. Meşə işinin by cur zəif inqişafь nə ilə izah olynyr?

Ilq əvvəl byny nəzərdə dytmalь qi, bir çok meşələr istismar olyna bilməjir və olynmamalьdyr. By meşələr cumləsinə sy və toprak saklamak əhəmijjətinə maliq olan meşələr daxildur. Jykarьda Azərbajcan qənt təsərrufatьnda syjyn əhəmijjəti barəsində sɵjləmişdiq. Təbiidur qi, dag meşələrinin sy məhafəzə etmə əhəmijjətini nəzərə aldьkda, hɵqumət bynlarьn tələf edilməsinə jol ver-

məmalidur. Meşələrin syjy məhafəzə etməq əhəmijjəti ilə bynlarьn topragь saklamak işindəqi roly məsələsi sькь bir rabitədədur. Çok vakt dag topragьnьn kalьnlьgь az olyb, umymijjətlə ɵzundən sy qeçirməjən və bɵjuq enişliƣi olan suxyrlar uzərində laj halьnda bylynyr.

By naziq toprak təbəkəsinin jyjylyb aparьlmamasьna səbəb agaclarьn qeqləridur. Meşəni kьrdьkda, by toprak təbəkəsi toprak syjy ilə jyjylyb asanlьkla aşagь suruşur. Topragьn uzərində olan qənlərlə birliqdə suruşməsi ittifakь az ƣɵrulməmişd'ır. By ittifaklar Lənqəran kəzasьnda olmyşdyr. Məhafəzə və sy saklama əhəmijjətinə maliq olan meşələr, butun meşə sahəsinin 40%-ini təşqil edir.

Byny da nəzərə almak lazьmdyr qi, meşə qutlələrinin başlьca kьsmь juqsəqliqdə, daglarьn başьnda vəz' olynmyşdyr; jolsyzlyk və çaj sisteminin pis halda bylynmasь, bynlarьn istifadə edilməsini çok çətinliqlərə salьr. Jykarьda ƣɵstərdiƣimiz qibi, Azərbajcanьn dag meşələri cumhyrijjətin umym meşə sahəsinin 82,8% təşqil edir. By dag meşələrinin umymi mikdarьndan 257.009-heqtar meşənin, jə'ni 30,7 fajizinin istismarь, meşə (materjalь) daşьjan jollarьn joklygyndan, gejri-mumqun və ja az mumqundur. Aran meşələrinə ƣəldiqdə, bynlar dəxi istismar uçun bir o kədər əlverişli şərtlər içərisində dəjildur. Əsas mane'liq, by meşələrin daima malareja xəstəliƣinin ocagь olan bataklьklarь dytmasьdyr. Byradan anlaşьlьr qi, by qejfijjət meşələrin istismar olynmasьnь çətinləşdirir.

Meşələrin nisbətən az bir kьsmьnьn kyrort əhəmijjəti vardyr və bynlar məhafizə olynyr (məsələn Baqь kəzasьnda Altьagac meşəbəjliq dajirəsi). Zakafkasija meşələrinin jaxşь bilicilərindən birisi olan professor Vinogradof-Niqitin, meşələrin kyrort əhəmijjətini by cur tevsif edir: „Meşələr havanьn təmizlənməsinə jardьm və havanь ozon gazь ilə təchiz edir; lazьmi sərinliƣi verir, quləqlərdən koryjyb iklimin qəsƣinliƣini jymşaldьr; meşələr, mualəcə sylarьnьn, çaj və bylaklarьn rezimini koryjyr və jamaclarь çɵqməqdən, yçmakdan və aşьnmakdan korymak uçun mɵhqəmlədir. Dag və meşələrin bir-birinə karьşmasь xusysi bir mənzərə jaradьb, təbiəti ƣɵzəlləşdirir və by da xəstələrin psixikasьna (sinir sisteminə) jaxşь tə'sir edib bynlarьn dincəlmələrinə və sagalmalarьna ardьm ədir. Byna ƣɵrə də meşələrin ehtijat ilə məhafizə olynmasьna və duşuncəli bir meşə təsərrufatьna xusysi dikkət jetirməq lazьmdyr". (Xydadadof „Zakafkazija" səhifə 102).

## 4. Azərbajcanda meşə təsərrufatьnьn tarixi.

Çar devrində dɵvlət meşələrini Baqь və Ƣəncədə olan Toprak və Devlət Əmlaqi Idarəsi idarə edirdi. Devlət meşələrinin idarə və korynmasьna məxsys olan bɵjuq bir ştatьn mevcyd olma-



sьna bakmajarak, meşə təsərrufatь inqişafь aşagь bir dərəcədə idi. Anarşi illərində (1918-1920-ci illərdə) meşələri hər qəs ɵz qejfi istədiƣi qibi kьrьb, çatьb, təmizləjib, jandьrmьşdyr. Byndan başka həman illərdə meşə talalarьnda və meşədən təmizlənmiş sahələrdə saqin olmyş muxtəlif qənt əhalisi—qeçərilər, meşələri kьrmьşlar və byralarda daxma və binalər tiqib meşələrdə ɵz xusysi jerlərində oldygy qibi jaşajьr və meşə agaclarьnь dəhşətli bir syrətdə kьrьrlar. Qeçərilərin bɵjuq hejvan suruləri də sahьblarьnьn meşələrə vyrdygy zijanь daha da çokaldьrlar. Meşə idarəsi və məhafəzə dəstəsi, dərin qeqlər atmьş və meşə təsərrufatьnь artьk dərəcədə dagьdan by bɵjuq bəla ilə mubarəzə etməƣə kadir dejildur.

1920-ci ildə Şyra hɵqumətı kyryldykdan sonra, butun meşələr milliləşmiş və hɵqumət malь olmyşdyr. Toprak komisarlьgь meşə təsərrufatь sahəsində əsas kərarlar kəbyl etmiş və meşə təsərrufatьnьn duzƣun təşqil olynmasьna və xalk təsərrufatьnьn bir şɵ'bəsi olan butun meşə təsərrufatьnьn tez bir zamanda bərpa olynyb duzƣun kyrylyşy uçun bir çok tədbirlərin həjata qeçirilməsinə başlamьşdyr.

## 5. Meşə təsərrufatьnьn idarə kyrylyşy.

Hali-hazьrda idarə barəsində cumhyrijjətin butun meşələri dərt mufəttişliq dajirəsinə bɵlunmuş və bynlarьn ixtijarьna 21—meşəbəjliƣi daxil edilmişdur. Meşəbəjliq idarə təşqilatьna 21—meşəbəƣi, 28—muavin və 355-atlь karayl daxil olyr.

Cumhyrijjətin butun meşələri 113-meşə jajlaklarьndan ibarət olyb, bynlardan 93 jajlak (meşə sahəsinin 83%) daglarda və 22-jajlak (meşə sahəsinin 17%) arandadyr. Meşəbəjliƣin orta hesabla sahəsi nmymən 57770 heqtar və jalьnьz meşə sahəsi 41420 heqtardyr. Atlь karayl dajirəsi bɵjuqluƣu 3270-heqtardyr. Mufəttişliq dajirəsi, aşagьda ƣɵstərilən kajda ilə meşəbəjliƣə bɵlunur:

**I-ci mufəttiş dajirəsi:**

| | | | | |
|---|---|---|---|---|
| 1. Prişib—talьş | meşəbəjliqi— | 58.466,5 | heqtar | meşə |
| 2. Lənqəran | „ | 22.484,5 | „ | „ |
| 3. Zyvand | „ | 35.556,9 | „ | „ |
| 4. Astara | „ | 46.10 ,0 | „ | „ |
| | Cəmi: | 162.614,9 | „ | „ |

**II-Iqinci dajirə:**

| | | | | |
|---|---|---|---|---|
| 1. Jalama | meşəbəjliqi | —14,257,2 | heqtar | meşə |
| 2. Kyba | „ | 25.990.0 | „ | „ |
| 3. Altьagac | „ | 20.669,7 | „ | „ |
| 4. Şamaxь | „ | 12.478,3 | „ | „ |
| 5. Ƣɵjçaj | „ | 31.485,7 | „ | „ |
| 6. Agdaş—Bym | meşəbəjliqi | —58.264,9 | heqtar. | |
| | Cəmi: | 163,145,8 | heqtar | |

**III. Uçuncu dajirə:**

| | | |
|---|---|---|
| 1. Ƣəncə meşəbəjliƣi | —54.740,9— | heqtar meşə |
| 2. Şamxor „ | 29.168,4 | „ „ |
| 3. Ƣədəbəj „ | 30.383,8 | „ „ |
| 4. Şəmsəddin „ | 28.830,5 | „ „ |
| 5. Agstafa-karajazь „ | 15.641,5 | „ „ |
| 6. Şəqi „ | 37.570,1 | „ „ |
| 7. Zakatala „ | 123.275,7 | „ „ |
| Cəmi: | 319,610,9 | „ „ |

**IV. Dərduncu dajirə:**

| | | |
|---|---|---|
| 1. Karabag meşəbəjliƣi | —112.088.0 | heqtar. |
| 2. Qurdustan „ „ | — 71.883,0 | „ |
| 3. Naxçьvan „ „ | 1.635,0 | „ |
| „ „ Cəmi: | —185.606,3 | „ |
| Butun dɵrt dajirədə | 830.968,9 | heqtar meşə |

**Kejd:** Meşənin umymi sahəsi arasьndaqь fərk (iləriqi səhifəjə bakьn) Mərqəzi Statistika idarəsi ilə Xalk Toprak Komisarlьgьnьn rəkəmlərinin dytyşdyrylmamasьndan (yjgynlaşdьrьlmamasьndan) iləri ƣəlmişdur.

## 6. Məşələrin tərqibi və əhəmijjəti.

Azərbajcan meşələri jalьnьz japraklь agaclardan ibarət olyb by agaclar aşagьda ƣɵstərilən nev'lərə bɵlunur:

| | |
|---|---|
| Fьstьk | 27% |
| Vələs | 26% |
| Palьt | 24% |
| Karaagac, agcakajьn, ƣɵruş | 14% |
| Kьzьlagac | 1,8% |
| Dəmiragac (ancak Lənqəran kəzasьnda) | 1,6% |
| Jalankoz | 1,0% |
| Kavak, azat (nil), agcakavak və iləx | 1,6% |
| Ardьc | 3,0% |
| Cəmi: | 100% |

Başlьca cinslər palьt, fьstьk, vələs, karaagac, ƣɵruş, cɵƣə, kьzьlagac, agcakajьn, kavak və başka agaclardan ibarətdur. Dag meşələrində agaclarьn ehtijati bər həqtara 280-dən 450-kyb metroja kədər, aran meşələrində isə 100-dən 200 kyb metroja kədərdur. Jaşca agaclar by cur bɵlunur: iri agaclar 44% və by cumlədən koca agaclar 15%, orta jaşlь agaclar 32% və cəvan agaclar 24 %.

Dag meşələrində tiqinti uçun işlədilən agaclarьn mikdarь 30%-dən 70%-ə kədərdur. Palьt odyncagьnьn juqsəq texniqi sifəti və kijmətli cinsi ilə (şabalьt japraklь palьt) cumhyrijjətin kəzalarь arasьnda Lənqəran kəzasь birinci jeri dytyr. By kəzanьn ımeşələri ɵzlərinə məxsys xusysijjətlərlə səçilir və onlarьn bəjuq stehsalat əhəmijjəti vardyr.



## 7. Meşədən nə məksəd uçun istifadə olynyr?

Kijmətli meşə nev'lərinin bol və muxtəlif olmasь, texniqi cihətdən jalьnьz meşə təsərrufatь dejil, meşə istehsalatь mikjasьnda belə Azərbajcan meşələrinin bəjuq əhəmijjəti oldygyny mejdana çьkarьb ƣɵstərir. Ilq əvvəl qɵmur, sirqə-tyrşy tozy, katran, agac jaglarь, agac spirti və kanifol almak uçun agacьn kyry distiləsini və kreozot, ƣviakol, tiakol, aşь xьlasəsi və içlərindən kymaş və ƣɵn bojamak uçun, bɵjuq əhəmijjəti hajiz olan ƣɵzəl uzvi bojaklar qibi başka preparatlarь əldə etməq məksədilə daha sonraqь qimijəvi işlənməsini kejd etməq lazьmdyr.

Azərbajcan meşələrində bitən bə'zi agac və bitƣi nev'lərinin: qitrə agacь, cɵƣə, moryk, bɵjurtqən, nar agacь və bijan qɵqunun bɵjuq ilac əhəmijjəti vardyr.

Laqin ən çok əhəmijjətli, janacak və muxtəlif inşaat materjalь hazьrlamak uçun Azərbajcan meşələrinin istismar olynmasьdyr.

## 8. Azərbajcan meşə tresti.

Azərbajcan meşə tresti ɵz işini aşagьdaqь təsərrufat vahidlərində: Lənqəran, Naxçьvan, Zakatala, Karabag və iləx.. kəzalarьn meşə tədaruq edən dajirələrində, Baqь taxta ambarь və odyn ambarlarьnda aparьr. Zavod tipində olan agac işləjici muəssəsələr Baqь taxta zavody, Veljamir boçka zavody və Zakatala parqet zavodyndan ibarətdur.

Azərbajcan meşə terstinin fealijjəti iqi jerə ajrьlьr: birisi qɵqlərdən odyncak hazьrlamak, o biri isə zavodlarda agaclarь işləməqdən ibarətdur; zavodlar isə başlьca ƣətirilən agac cinslərini (cɵƣə və tiqan japraklь) və ancak azca jerli agaclarь (fьstьk və palьt) işləjirlər. Azərbajcan meşə trestinin tədaruq etmə fəalijjəti, muxtəlif şpal, tir, palьt boçka taxtasь, çarx dəndələri, kapь və pəncərə dabanь, odyn və iləx... hazьrlamakdan ibarətdur.

Tədaruq olynmyş materjallarьn başlьca muştəriləri: dəmir joly (şpal və tirlər), eksport təşqilatlarь (Fransьz boçka taxtalarь, koz agacь), tokycy trestləri (dmiragac), ticarət və əhali (odyn, pəncərə və kapь dabanlarь, çarx dəndələri) və Azərbajcan zavodlarь (palьt və fьstьk)dyr.

## 9. Şyra Azərbajcanьnda meşə işlərinin ƣələcəq planь.

Meşə işinin ƣələcəq planь uzrə Baqьda balьk doldyrmak uçun ildə 650 min komplekt boçka hazьrlajan bir boçka zovodonyn bina olynmasь təsəvvur olynyr. Zavod 1928/29-cy ildə tiqilib 1930/31-ci ildə işə salьnmalьdyr. Zavod 1,2 miljon rybləjə başa ƣələcəqdur.

## II. JYN, JYN VƏ TIQIŞ SƏNAJEI.

### 1. Azərbajcanda kojynçylygyn inqişafь uçun əlverişli fiziqi və cografi şərtlər.

Azərbajcanda kojynçylyk, başlьca sənaje xam malь olan jyn mənbəi olmak uzrə çok əhəmijjətlidur.

Başlьca kojynyn ətindən, dərisindən və jynyndan istifadə olynyr. Ət və dəri barəsində kojynyn əhəmijjəti çok bəjuq isə də ancak jerli ərz və tələbin hudydy xaricinə çьkmьajr. Jyna qəlincə, o birincisi—çok mikdarda jerli sənaje tərefindən (xalça palas uçun) istifadə olynyr. Iqincisi hər jerdən kabak Ittifak və sonra Azərbajcan bazarlarьnda satьlьr.

Kojynçylyk uçun qeniş otlak olmalьdyr. Azərbajcanda isə (3-cu vəzifədən) bildiqimiz uzrə, otlak, əryş və qollyk butun əlverişli topraklarьn 50%-ni təşqil edir. By otlaklarьn çok hissəsi çok jaxşь Alp cəmənliqlərindən ibarətdur qi, bynlar daha çok illər gejri qənt təsərrufat məksədlərindən ətru istifadə olyna bilməz. Mygan, Mil və Saljan çəllərində kьş çok jymşak qeçir. Bynlar pajьzda bitqilər ilə ərtulur, by bitqilər kьş ajlarьna kədər davam edir və by syrətlə kojynlar uçun təbii bir kьş otlagь (kьşlak) vəzifəsini qərur. Jaj qəlib də bitqilər jandьgь və çəllər səhra halьna çevrildiqi zaman isə Alp otlaklarьna jol açьlьr. By syrətlə Azərbajcanьn bəjuq bir hissəsi qəçəri maldarlьk (xusysilə kojynçylyk) uçun ən jaxşь bir rajondyr.

Jajlьk otlaklarda kojynlar təmiz havadan istifadə edir və jaxşь bəslənirlər. Kьşda isə iş ajrь curdur. Kьşlarda təmiz sylar jokdyr, kojynlar dyrgyn batlak sylarь içirlər. Darьskal, karanlьk, çirqli, toprak daxmalarda jaşajьrlar və pozyk hava ilə nəfəs alьrlar. Kojynlar yzyn zaman çirq və pejin uzərində jatdьkda ag jynlarь sarьja çevrilir. Çok zaman kotyr xəstəliqinə dytylyrlar. Çok kar jagdьgь zaman bərq aclьk başlajьr; çunqu kojynçylar deməq olar qi kьş uçun heç jem hazьrlamajьrlar.

### 2. Kojynçylygyn dinamikasь və Azərbajcanьn kojyn ilə tə'min olynmaklыgь.

Azərbajcanda kojynçylyk dinamikasь aşagьdaqь rəkəmlər ilə karakterize olynyr:

| Illər | Baş |
|---|---|
| 1913 | 2 107 700 |
| 1915 | 2 182 543 |
| 1921 | 886 549 |
| 1923 | 920 000 |
| 1924—25 | 2 123 900 |
| 1925—26 | 2 279 000 |
| 1926—27 | 2 438 500 |

1927-ci ildə qeçilərin mikdarь 305000 dən az dejildi.



Başka devlətlərə nisbətlə Azərbajcanьn kojyn ilə tə'min edilməsi aşagьdaqь cədvəl ilə tə'jin olynyr:

JETIŞMIŞ KOJYN VƏ QEÇILƏR.

| | 1 təsərrufata | 100 nəfərə | 100 heqtar əqinə. |
|---|---|---|---|
| Azərbajcanda | 3 | 62 | 112 |
| Qurcistanda | 2,6 | 54 | 160 |
| Ermənistanda | 5 | 103 | 294 |
| Z. S. K. Ş. C —də. | 3 | 65 | 148 |

**Gejri əlqələrə qəldiqdə, 100 nəfər orta hesab ilə:**

| | |
|---|---|
| Jeni Zelandijada | 2200 baş |
| Avstralijada | 1800 „ |
| Arzentinada | 1000 „ |
| Inqiltərədə | 100 „ |
| Şyralar Ittifakьnьn Asja hissəsində | 70 „ |
| Şyralar Ittifakьnьn Avropa hissəsində | 30 „ |

duşur.

### 3. Kojyn cinsləri. Jyn hasilatь və onyn tədaruq edilməsi.

Azərbajcanda jetişdirilən kojynlar, deməq olar qi, hamьsь jerli cins olyb kyjrykly tip kojynlardandyr. Kojynlarьn kyjryklarьndaqь jag, ən çok kojynlar jajlakda bylyndyklarь zaman əmələ qəlir və by jag, jem az oldygy zaman, kьşda aclьk başladьkda hejvanь aclьk əlumundən koryjyr.

Azərbajcanda 9 jerli cins kojyn oldygy muəjjən e ilmişdur: Karabag, cinsi, Şirvan çinsi, bozax cinsi, ləzqi cinsi, heriq cinsi, cary cinsi, Balbas cinsi və qədəq və mazox cinsindur. Bynlardan ən çok jajьlmьş olanь Karabag cinsidur. By cinsə Myxtar Daglьk Karabag əlqəsində, Agdamda, Qurdustanda, Cəbrajьlda, Qəjçaj və Saljan kəzalarьnda təsaduf olynyr.

Karabag cinsindən sonra Şirvan cinsi qəlir. By cinsə Baqьda, Lənqərandan, Şamxorda təsaduf olynyr.

Bozax cinsinə Kazak və Qəncə kəzalarьnda təsaduf olynyr.

Sajьlan dokkyz cinsdən əsas cinslər: Karabag, mazox, ləzqi və balbas cinsləridur. Kalanlarь isə mələzləşdirilmiş cinslərindən ibarətdur. Məsələn, heriq cinsi—ləzqi ilə tyşin (qurcu cinsi) cinslərinin mələzidur. Şirvan cinsi—ləzqi ilə Karabag cinslərinin mələzidur və iləx.

Jetişmiş kojynlar, 2 qilogram (5 qirvənqə), jaz kyzylarь isə—1 qilogram jyn verir. Halby qi, Avropanьn ən jaxşь cinsi olan meri-

nos isə 8 qilogram jyn verir. Byndan başka axьrьncь qejfijjətcə daha jaxşь oldygyndan daha baha satьlьr.

Bizim jynlarьmьzьn qejfijjəti, kojynçylygyn bylyndygy təbiət şərtlərindən asьlьdyr. Kojynyn jyny, jaj zamanьnda jaxşь bəslənməq və bynynla əlakədar olarak təbii inqişaf nəticəsində çok jogyn və məhqəm olyr, kьş jyny isə az məhqəm olyr. Bynyn səbəbi isə kojynlarьn kьşda jarь ac jaşamalarьdyr.

Kojynlar umymijjətlə jaz və pajьzda olmak uzrə ildə iqi dəfə kьrxьlьr. Jazda çok zaman kojynlar jajlaga qөndərmədən kabak kьrxьlьr. Ancak çok arьk və sagmal kojynlar jajlakda da kьrxьlьr. Pajьz kьrxьlmasь jajlakda edilir, laqin bə'zən qeciqilir və o halda kojynlar arana qөçurulduqdə kьrxьlьr.

Bynlar çok zaman kьrxma zamanьna və kojynyn jaşьna (kyzylardan, sagьlan və sagьlmajan kojynlardan) qөrə sortlara ajrьlьr.

Azərbajcanda jynyn umymi hasilatь, muxtəlif illərdə by cur dəjişmişdur:

| | | |
|---|---|---|
| 1924—25-ci ildə | 3 347 392 | qilogram |
| 1925—26-cь „ | 3 591 200 | „ |
| 1926—27-ci „ | 3 840 800 | „ |

1926—27-ci il mevsimində jajda bazara 399 040 qilogram jyn çьkarьlmьşdь. Jyny başlьca tədaruq edənlər Qөj-Birliqi və Azərittifakdyr. 1923-cu ildən bəri xaricə jyn qөndərilməməqdə və hamьsь Şyralar Ittifakьnьn jyn sənajeinə verilməqdədur.

## 4. Mahьt sənajei.

Azərbajcanda mahьt sənajei, Şyralar hөqumәti zamanьndan kyrylan və „Kьzьl Azərbajcan" adlanan Qəncə mahьt fabriqi tərəfindən təmsil edilməqdədur. „Kьzьl Azərbajcan" 1925—26-cь illərin ortasьndan istehsalat işinə başlamьşdyr. By fabriq nisbətən çok bөjuq dejildur. 1.500 iji və 35 000 dəzqahь vardyr.

Hali-hazьrda fabriq jerli cins jyn işlətməqdə və mahьt, odejal və gejri qobyd jyn tokymalarь hazьrlamakdadyr. Fabriqdə orta hesab ilə 223 işçi, həm əjirmə və həm tokyma şө'bələrində iqi nevbədə çalьşьr.

Fabriqin mə'mylatь başlьca Qəncə rajonynda və kismən Baqь və Azərbajcan kəzalarь bazarlarьnda satьlmakdadyr.

Fabriqin qənişləndirilməsi lajihəjə alьnmьşdyr. Fabriqdə jyn jьkama şө'bəsi, jyn skladь və gejri tiqləcəqdur.

Fabriqin təchizatьnь jeniləşdirərəq 1930—31-ci illərdə onyn istehsalatьnьn 245 000 metroja kədər artьrьlacagь təsəvvur edilməqdədur qi, by mikdar, hali-hazьrqь istehsalatьndan oldykca juqsəqdur.



## 5. Tiqiş sənajei.

Azərbajcanda və hətta butun Zakafkasijada, hər cur hazьr paltar kajьran və muqəmməl syrətdə təchiz edilmiş olan jeqanə muəssəsə, Baqьda Azərpaltarьn idarəsi altьnda bylynan Voladarsqi adьna olan fabriqdur.

Azərpaltar, өz mə'mylatьnьn satьşьnь tamamilə tə'min etmiş, bөjuq bir cumhyrijjət trestidur. Voladarsqi fabriqində istehsalat elektriqləşdirilmişdur. Byrada utuləri kьzdьrmak uçun gaz stansijalarь vardyr. Voladarsqi fabriqində istehsalat o kədər səmərələşdirilmişdur di, by fabriq Şyralar Ittifakьnda bylynan tiqiş fabriqlərinin ən jaxşьlarьndan biridur.

1926-cь ildən Qəncədə ajrьca bir fabriq açьlmьşdyr. By fabriq hərbi libas hazьrlamak uzrə tərtib edilmişdur. Byndan başka, Azərpaltar Baqьda dəri və xəz fabriqi açmakdadyr. Azərpaltar өz mə'mylatьnь Baqь bazarlarьnda və həmçinin Turqistanda satьr.

# III. IPƏQÇILIQ VƏ IPƏQ SƏNAJEI.

## 1. Ipəqçiliq.

Azərbajcanьn qənt təsərrufatь əsəs bөrt istikamət uzrə qetməqdədur:

1)maldarlьk, 2) əqinçiliq, 3) təxnika, 4) uzumçuluq.

Ancak by əsas təsərrufatlardan başka, iqinci dərəcəli bir çok xьrda qənt təsərrufat sahələri də vardyr. By sahələr mustəkil bir əhəmijjət kazanmamьş və ancak camaatьn ilavə bir məşgylijjəti olmyşdyr. By cur qənt təsərrufat sahələrindən biri də ipəqçiliqdur.

Ipəq, „barama qəpənəqi" dejilən qəpənəqin baramasьndan istehsal edilir. Adəta təsərrufatda „barama kyrdy"ndan bəhs edilir; çunqu by qəpənəq pambykçyja ən çok mənfəəti birinci dəfə olarak, həjatьnьn surfə devrində verir qi, by devrdə o, dogrydan da kyrda oxşar.

Barama kyrdynyn həjatь ən kьsa olarak by syrətlə qөstərilə bilər:

Barama kyrdynyn həjatь—surfə devri, pyp devri və qəpənəq devri olmak uzrə 3 devrə ajrьlьr. 6-cь şəqildə, jykarьda jenicə dogylmyş jə'ni jymyrtadan çьkdьgь birinci qөndəqi kyrt qөstərilmişdur (*şəqil*-6, *fiqur*-1). Aşagьda, kyrdyn bəslənib baramasьnь sarьmaga hazьrlandьgь zaman qөstərilir. Şəqildə barama kyrdy təbii bөjuqluqundə qөstərilmişdur. Əqər jem japragь barama kyrdynyn toxymy uzərinə kojylarsa, o zaman toxymdan çьkan kyrt o saat jeməqə başlajьr. Kyrdyn surfə devrindəqi butun həjatь çok sadə bir syrətdə qeçir, jejir və bөjujur. 33 qunluq surfə devrinin təxminən 5 qununu jyky halьnda qeçirir.

Kyrt ɵz baş ilə 8 rəkəminə okşar bir hərəqət edərəq ɵz ətrafьnda az zaman içərisində 400—800 metro yzynlygynda butɵv bir sapdan, biri-biri dalьnca olan ilqəqlərdən əmələ qəlmiş bir barama sarьjьr. Kyrt baramalandьkdan 8 qun sonra pyp şəqlinə çevrilir (*şəqil*-6, *fiqur*-12 *və* 13) və 8 qun daha sonra pypdan qəpənəq çьkar qi, qəpənəq də baramanь deşib dьşarьja çьkьr [1]).

Ərqəq qəpənəq baramadan çьkdьkdan az sonra dişini axtarьb tapьr, onynla çiftləşir və ciftləşmədən bir neçə saat sonra dişi qəpənəq toxym byrakmaga başlajьr.

Indi, Azərbajcan pambykçylygynyn texnikasьnь muxtəsər syrətdə təsvir edəq:

Barama qəpənəqi, toxym kojdykdan, ipəq sap əmələ qəlincəjə kədər olan butun proses aşagьdaqь devrlərə ajrьlьr:

1) toxymlarь jьgmak,
2) toxymlarь kyrytmak və canlandьrmak,
3) kyrtlarь çьkarmak və bəsləməq,
4) baramanь bogmak və kyrytmak,
5) baramanьn ipəqini açmak.

Azərbajcanda ən sadə və ən jajьlmьş toxym hazьrlanmasь ondan ibarətdur qi, sarьlmьş baramalardan ən iri və ən mɵhqəmləri dɵl uçun seçilir, bynlar ja sapa duzulur və ja sadəcə taxta bir kaba kojylyr və byrada qəpənəq çьkar. 16 qilogram baramadan 1, 2—1, 6 qilogram toxym əldə edilir. Əqər alьnan toxym daha az olarsa, by, kyrtlarьn naxoş oldyklarьnь qɵstərir.

Azərbajcanda toxymlar çok pis korynmakdadyr. Umymijjətlə toxymlarь bir əsqijə kojyb bərq baglajьr və sandьga kojyrlar və ja bir qupəjə kojyb agzьnь baglajьrlar, sonra ja tavana asьr və ja qi evdə bir jerə kojyrlar.

By usyl ilə korynan toxymlar çok zaman pozylyr və ja vaktьndan kabak, jə'ni (martьn axьrьnda) tyt agacь tymyrcyklanmakdan əvvəl canlanьr və by syrətlə kyrtlarь saklamak uçun cur-bə-cur şejlərlə bəsləməq lazьm qəlir.

Toxymlar tyt agaclarь japraklandьgь zaman dirildilir.

Toxymlarьn ən sadə jerli diriltmə usyly ondan ibarətdur qi, kadьnlar toxymy koltyk altьna kojyb kyrtlar çьkana kədər orada saklajьrlar. Əqər çok mikdarda toxym diriltməq lazьm qəlirsə, o zaman naziq kat halьnda qagьza, boşkaba və gejrəjə səpirlər və kyrt çьkana kədər otakda saklajьrlar.

Toxymlarьn məhsyllylygyna qəlincə, Azərbajcanda məşhyr iktisadijjatçь olan Avdejev by məsələ barəsində aşagьdaqь bəjanatь verir:

[1]) Qunlər temperatyr şərtlərindən asьlь olarak, artьk və əqsiq ola bilər. Byrada qɵstərilənləri orta bir ədəd hesab etməlidur.

Redaksija.



„Toxymlarьn jaxşь cins olmamasь və kyrtlara jaxşь bakmamalarь uzundən, Azərbajcan ipəqçiləri, xarici ipəqçiləri qənara kojdykda belə, Qurcistanьn gərb hissəsindəqi ipəqçilərə nisbətlə həmişə daha az mikdarda və daha pis cinsli barama əldə etmişlər və etməqdədurlər. Mutəxəssislərin muşahədələrinə qɵrə, Azərbajcanda 25 gramlьk bir kyty toxymdan orta hesab ilə 19,5 qilogram və ən artьgь 20 qilogram xam barama əldə edilir; halby qi, səmərəli kyllyk etdiqdə 4 gram toxymdan 7,5—12,8 qilogram xam barama əldə edilməlidur. By hesab ilə bir kyty toxymdan 43,5—76,8 qilogram xam barama əldə edilməlidur." (Azərbajcan qənt təsərrufatьnьn bərpa və inqişafьnьn qələcəq planь, səhifə-404).

Azərbajcanda kyrtlar çok gejri mədəni bir syrətdə, otaklarda, çardaklarda, sarajlarda bəslənir və çok az hallarda xusysi binalar tiqilir. Kyrtlar dɵşəmədə, boşkablarda, həsir ustundə saklanьlьr. Bəsləmə 2—$2^1/_2$ aj, jə'ni normaja qɵrə lazьm olandan 30—40 qun artьk surur. Kyrtlara ilq qunlərində qundə 2—3 dəfə, tyt japragь verirlər, sonra ustlərinə japraklь təzə tyt bydaklarь kojyrlar. Kyrtlara duzqun kyllyk etməjirlər və nəticədə kyrtlarьn ɵlumu adi bir hadisə olyr.

Bəsləmə kyrtarandan sonra 2—3 həftə davam edən, barama sarьma zamanь başlajьr. Baramalarьn sarьlmasь kyrtarandan bir iqi qun sonra onlarь jьgьrlar, bir hissəsini dɵlluq ajьrьrlar və kalanьnь o saat xam şəqildə satьrlar. By xam baramalar jerli ipəq zavodlarьna qedir. Əqər hər hansь bir səbəbə qɵrə satma yzanarsa və ja baramalar başka jerə qɵndəriləcəq olarsa, o zaman onlarь kabakca bogyr və kyrydyrlar.

Baramanь bogmakdan məksəd: pypy ɵldurməq və by syrətlə ondan qəpənəqin çьkmasь uçun baramanь deşməsinin kabagьnь almakdyr.

Baramalar adət uzrə ja byxar və ja bə'zən ocaklar vasitəsilə bogylyr. Ocaklarda baramalarь kьzgьn havanьn tə'sirilə bogyrlar; bogylmyş baramalar qunəşdə kyrydylyr, sonra sortlara ajrьlьb 50—80 qilogramlьk ali meşoklara tɵqulur.

Səjlənilən ibtidai kyrytma usyly, qet-qedə aradan qɵturulmədədur. Hali-hazьrda bogma ilə barabar ejni zamanda mexaniqi kyrytma işlədilir (Qurcistanьn ipəqçiliq rajonlarьnda), byndan ɵtru xusysi bogma-kyrytma dəzqahlarь vardyr. By dəzqahlarda butun bogma və kyrytma operasijalarь birdən edilir.

Xalk Toprak Komisarlьgь 1927-ci ildə Zakatalada by cur muqəmməl bir bogma-kyrytma dəzqahь kyrmyşdyr. 1929-cy ildə isə Ordybadda (Naxçivanda) kyrylmasь lajihəjə alьnmьşdyr.

Byndan ilavə mexaniqi kyrytma dəzqahlarьnьn ədədini, beş illiqin axьrьna kədər, Azərbajcanьn hamь baramа məhsylynyn kyrydylmasьnь 100% ən səmərəli usyl ilə aparmaga qafi qələcəq kədər artьrmak təsəvvur olynyr.

Xam barama tədaruqu ilə məşgyl olan Qəj-Birliqinin ixtijarьndaqь adi kyrytma mintəkələri aşagьda qөstərilmişdur.

| | | |
|---|---|---|
| Zakatala kəzasьnda | 5 | mintəkə |
| Şəqi " | 11 | " |
| Qөjçaj " | 14 | " |
| Şamaxь " | 3 | " |
| Agdam " | 12 | " |
| Qurdustanda | 1 | " |
| Cəbrajьl " | 5 | " |

Həmçinin Myxtar Daglьk Karabag Өlqəsində və Naxçьvanda da vardyr.

Azərbajcana baramalardan ipəq həm əl və həm mexaniqi usyllar ilə açьlьr. Baramanьn mexaniqi usyl ilə açьlmasь, xusysi ipəq açma muəssəsələrində byxar maşьnlarь vasitəsilə icra olynyr. Açьlmьş ipəqin çok hissəsi eşilməmiş halda satьlьr. Kalan hissəsi isə jerli ipəq-eşmə muəssəsələrinə qedir və oradan cur-bə-cur jerli mə'mylat kajьrmak uçun satьlьr.

## 2. Dunja ipəqçiliqinin mərqəzləri və Azərbajcanda ipəqçiliqin jajьldьgь rajonlar.

Dunja ipəqçiliqinin mərqəzləri Çin və xusysilə grez ipəqini (grez – ipəq açan fabriqlərində baramanь açanda alьnan xam ipəqdur) verən Japonijadyr. Avropada başlьca ipəqçiliq mərqəzləri Italija və sonra Italijadan oldykca qeridə olan Fransadyr. Ipəq baramalarь hasilatьnda Rysja hərbdən kabakqь illərdə beşinci jeri dytyrdy. Hali-hazьrda isə Şyralar Ittifakь by xusysda dərduncu jeri dytyr. Birinci jeri Japonija, iqinci jeri Çin və uçuncu jeri isə Italija dytmakdadyr. Şyralar Ittifakьnda ipəqçiliq nөkteji-nəzərindən təsərrufat əhəmijjəti olan jerlər birincisi—Zakafkasija, iqincisi—Turqistandyr. Zakafkasijada isə ipəqçiliq hər uç cumhyrijjətdə də inqişaf etmişdur.

Ipəqçiliqin başlьca rajonlarь Qur çajьnьn həm sol sahilində (Şəqi, Zakatala, Qөjçaj və qeçmiş Agdaş kəzalarь) və həm sag



sahilində (Myxtar Daglьk Karabag Өlqəsi, Cəbrajьl və Agdam kəzalarь) və Naxçьvanda bylynmakdadyr.

Ipəqçiliq ilə orta hesab ilə 50,000 təsərrufat məşgyl olmakda və by təsərrufatlarda kadьn və qişi olmak uzrə 250,000 nəfər çalьşmakdadyr. Başka təsərrufatlardan fərkli olarak ipəqçiliqdə kadьnlarьn da çalьşdьgьnь jadda saklamalьdyr.

Ipəqçiliq uçun ən muhum şərt, barama kyrdyna jem olan tyt agaclarьnьn əqilməsidur. Tyt agacьnьn əqilmə karakteri hər jerdə bir dejildur. Bə'zi kəzalarda tyt agaclarь uçun xusysi bagça duzəldilmişdur; bə'zilərində tyt agaclarь başka agaclar ilə karьşьk bylynyr; uçunculərdə tyt agaclarь, jol, binə, bostan, çaj və kanal sahili bojynca əqilmişdur. Tyt agaclarьnьn umymi sahəsi aşagьdaqь uzrə dəjişilir:

| | |
|---|---|
| 1924-cu ildə | 35 000 heqtar. |
| 1925-ci " | 35 000 " |
| 1926-cь " | 35 000 " |
| 1927-ci " | 35 000 " |
| 1928-ci " | 36 000 " |

1929-cy ildə by sahənin, 37,085 heqtara kədər çatdьrьlmasь təsəvvur olynmakdadyr.

Azərbajcanda xalis tyt agaclьgь sahəsi 8,000 heqtardan artьk dejildur qi, bynyn çok hissəsi Şəqi kəzasьna duşur.

## 3. Azərbajcanda baramaçьlьk və barama toxymy jetişdirmə işləri.

1913—14-cu illərə kədər Azərbajcanda ipəqçiliq qəntli təsərrufatlarьnda bөjuq rol ojnajьrdь. Barama istehsalatь—3,000 tondan artьk idi. Camaat 200,000 kytydan artьk toxym işlədirdi. Azərbajcanьn bir çok qəntliləri baramaçьlьkdan daimi kazanc əldə edirdilər. On minlərcə xalk, butun il yzyny Şəqi, Zakatala kəzalarьnьn, Daglьk Karabagьn ipəq açan zavodlarьnda məşgyl idilər.

Şamaxь ipəq tokyma fabriqləri sənaje və əl istehsalatь sərqilərində birinciliqi kazanardь. Becərilən baramalarьn mikdarь jerli ehtijacь tə'min etməqdən başka, bir çok barama və toxym xaricə də qөndərilirdi.

Imperializm muharəbəsi və millətlər arasьndaqь tokyşma zamanьnda ipəqçiliq çok duşdu. Ancak 1921-ci ildə Azərbajcanda Şyra hөquməti kyrylandan sonra xaricdən qətirtilmiş 15 min kyty toxym pajlandьkdan sonra ipəqçiliq bərpa edildi.

Jerli toxym jetişdirmə (grenaƶ) işinin inqişaf diagramь.



Şəqil-8

Kejd etməq lazьmdyr qi, xaricdən ƣətirilən toxym kijmətcə baha olmakdan başka qejfijjətcə də jaxşь çьkmamьşdyr. Həqumət toxymy daxildən tədaruq etməq və kijmətcə baha və həm qejfijjətcə jaxşь olmajan xarici toxymdan kyrtylmak uçun hər bir tədbiri ƣərmuşdur. By tədbirlərin nəticəsi olarak 1928-ci ildə daxildə toxym tədaruqц 80 min kytyja çatdьrьlmьş və Azərbajcan ipəqçilərinin toxym ehtijacь tamamilə tə'min olynmyşdyr.

1928-ci ildə Xalk Toprak Komisarlьgь altь toxym tədaruq edən stansija təşqil etmişdur qi, bynlarьn istehsalatь by curdur:

| | | | |
|---|---|---|---|
| Şəqi stansijasь | 19654 kyty | | |
| Zakatala „ | 12540 „ | | |
| Ordybad „ | 16868 „ | (Naxçьvan əlqəsində) | |
| Vartaşen „ | 13496 „ | (Şəqi kəzasьnda) | |
| Agdaş „ | 9200 „ | | |
| Agdam „ | 8491 „ | | |
| Ƣəncə „ | 1104 „ | (1928-ci ilə kədər varidi). | |
| Cəmi: | 81351 „ | | |

1928-29-cy illərdə Stepanaqertdə (Myxtar Daglьk Karabak Əjaləti), Naxçьvanda, Ƣəjçajda, Karjaƣində, Cəbrajьlda, Balaqəndlə (Zakatala kəzasьnda) də toxym stansijalarь açьlacakdyr.

Ony da kejd etməlidur qi, Azərbajcanьn butun ipəqçiliƣinin başьnda, Ƣəncədə bylynan Azərbajcan ipəqçiliq stansijasь dyrmakdadyr. Şyra həqumətі zamanьnda açьlmьş olan by iri və elmi təşqilat aşagьdaqь vəzifələri əhdəsinə ƣəturulmuşdur:

1) toxym istehsalь.

2) barama kyrtlarьnьn numynəvi bəslənməsi qi, byndan məksəd həm əməli olarak barama kyrdlarьnьn bəslənməsini əƣrətməq və həm də dəlluq baramalar əldə etməqdur.

3) nəzəri və əməli olarak tə'limatçьlar, toxymçylar və mədəni ipəqçilər hazьrlamakdan ətru kyrslar təşqil etməq.



4) həm jerli və həm xaricdən ƣətirilən toxymlarь kontrol etməq; (by kontroldan məksəd, toxymlarda bir xəstəliq olyb-olmadьgьnь tə'jin etməqdur).

Xam baramalarьn hasilatьna ƣəlincə—by, şubhəsiz qi, ipəqçinin əldə etdiƣi toxym mikdarьndan asьlьdyr.

Orta hesab ilə 1909—1913-cu illərdə Azərbajcanda xam baramalarьn mikdarь jyvarlak hesab ilə 3,200 tona çatmьşdь.

1921-ci ildən başlajarak, by məhsyl ildən-ilə artarak aşagьdaqь mikdara çatmьşdyr:

| | | | | | |
|---|---|---|---|---|---|
| 1921-ci il | 256 ton | 1 kytydan | 20 qlg. | məhsyl | hesabь ilə. |
| 1922-ci „ | 400 „ | 1 „ | | | |
| 1923-cu „ | 960 „ | 1 „ | | | |
| 1924-cu „ | 1360 „ | 1 „ | 20,5 „ | „ | „ „ |
| 1925-ci „ | 1504 „ | 1 „ | 22,5 „ | „ | „ „ |
| 1926-cь „ | 1654,2 „ | 1 „ | 24,6 „ | „ | „ „ |
| 1927-ci „ | 1852 „ | 1 „ | 24,2 „ | „ | „ „ |
| 1928-i „ | 2544 „ | 1 „ | 32 „ | „ | „ „ |
| 1929-cy „ | 2880 „ | 1 „ | 27,8 „ | „ | „ „ |

### XAM BARAMALARЬN UMYMI HASILATЬ PROGRAMЬ

1929-cy ilə ajid rəkəmlər təxminidur.

Xam baramalarьn umymi hasilatь həm pajlanan kytylarьn mikdarьndan və həm hər kytynyn məhsyllygyndan asьlьdyr. 1921-ci ildə, hər kytydan 20 qilogram hesabь ilə, cumlətanь 256 ton xam barama alьnmьşdyr qi, belə az hasilat baramaçьlьgьn çok pis vəzijjətdə bylyndygyny və ƣərulmuş tədbirlərin jetməдiƣini ajdьn syrətdə ƣəstərir.



Şəqil-9.

Bir kytydan alьnan hasilat, axьrьncь cədvəldən ƣəruldyƣu uzrə, ildən-ilə artьrsa da, laqin biz hələ qi, təbii normadan çok yzakdajьk. Çunqu toxymlar səmərəli usylda hazьrlanьb, jaxşь kyllyk edildiqdə hər kytydan 43—76 qilogram almalьjьk.

Bynynla barabar ony da kejd etməlidur qi, biz xam baramanьn umymi hasьlatьnda çok kabaga ƣetmişiq. Məsələn 1921-ci ildə 250 ton aldьgьmьz halda, 1922-ci ildə by mikdarь 400 tona çatdьrmьş və by syrətlə ipəq sənajeinin əsasьnь məhqəmlətmişiq.

Umymijjətlə deməq lazьmdyr qi, ipəqçiliƣin təbii inqişafь, bir çok gejri şejlərdən başka, bizdə butunluqlə toxymyn varlьgьndan, onyn kijmət və pajlanmasь şərtlərindən və ən nihajət pambykçylar tərəfindən xam baramalarьn satьlmasьndan asьlьdyr.

Sɵz jok qi, toxym tamamilə saglam olmalьdyr. Ipəq kyrdynyn xəstəliƣinin azalmasь və ja tamamilə kabagьnьn alьnmasь ancak saglam və mɵhqəm toxym sajəsində mumqun olar.

Ipəq kyrdynyn xəstəliƣi bir rajonda ipəqçiliƣi tamamilə jok edə bilir. Məsələn: 1861-ci ildə əvvəla Ƣurcistanda və sonra Azərbajcanda kyrdlarьn xəstələnmə nişanələri başlamьş və Zakafkasijada kyrtlarьn qutlələr ilə məhv olmadьklarь bir jer kalmamьşdь. Bir çok ipəqçilər saglam kyrtlar jetişdirməq uçun bir neçə il çalьşьb və nəticə ala bilmədiqlərinə ƣɵrə, ipəqçiliqdən əl çəqmişlər və hətta tyt agaclarьnь dograjьb onlarьn jerinə başka bitƣilər əqməƣə başlamьşlar. Zakafkasijanьn (və xusysilə Azərbajcanьn) ipəqçiliq istehsalatь çok (ən azьndan 5-6 dəfə) azaldь. Ancak 1872-ci ildən, Japonjadan saglam toxymlar ƣəlməƣə başladьkdan sonra, xəstəliq qəsildi və ipəqçiliq bərpa edilməƣə başladь.

Ipəq kyrtlarьnьn cinslərinə ƣəlincə, 70-ci illərə kədər Azərbajcanda jerli toxymlar inqişaf etmişdi və bynlar jalьnьz jerli cins idilər. Laqin 1870-ci ildən 1880-ci ilə kədər olan devrdə jerli cinsləri japon cinsləri əvəz etmişdi. Japon cinsləri bir para rajonlarda indijə kədər vardyr. 80-ci illərdə Cənybi Avropada kyrd xəstəliƣi (pebrin) ilə aparьlan mubarəzə musbət nəticələr verməqlə Fransa və Italijadan toxym ƣətirilməƣə başlandь. Ejni zamanda Turqijədən də Bagdad cinsi toxym ƣətirdilməƣə başlandь qi, by cins sonradan Avropa cinsini aradan çьkardь. Bagdad cinsi bol məhsyl verməqlə barabar çok da davamlь olyr.

Hali-hazьrda Azərbajcan xaricdən heç toxym ƣətirməjib ɵz toxymy ilə qifajətlənir və Azərbajcanda hazьrlanan toxymlar ipəqçijə ƣetməzdən kabak Ƣəncə ipəqçiliq stansijasь tərəfindən joklanьlьr və kontrol edilir.

Byꞑynla barabar ony da ƣɵstərməlidur qi, jerli toxymyn hazьrlanma xarcь çok azalmьşdyr: bir kyty toxymyn dyryş kijməti 1924-cu ildə-3 manat 50 kəpiq idi, 1928-ci ildə isə-2 manat 55 kəpiƣə duşmuşdur.

## 4. Azərbajcanda ipəq açma sənajei

Ipəq açma sənajeini hali-hazьrda iqi trest, Azərbajcan ipəq tresti (Azəripəq) və Karabag ipəq tresti (Karipəq) aparmakdadyr.

Azəripəqin hej'ətinə, Şəqidə 495 tijanlь (tijan—içərisində ьlьksy olan metal kabdyr qi, bynlarda barama dɵjulur) işləməqdə olan beş zavod daxildur. Byndan başka Naxçьvan Qɵj-Birliƣinin Ordybadda 4 zavody vardyr qi, bynlarьn uçunun bir jerdə 100 tijanь vardyr və by zavodlarь Qɵj-Birliƣi ɵzu işlədir, dɵrduncu za-




Şəqil - 10. Ipəq kvıdynyn bəjuməsi, barama, qəpənəq kyrdy, bəsləmə dəzƣahь (tərəcə), barama bogan ocak.

vody isə əl istehsalçьlarь işlədir. 1929-cy ildə Şəqidə 576 tijanlь altьncь zavod açьlacakdyr. By zavod dunjadaqь ipəq zavodlarьnьn hamьsьndan ꞡuclu olacakdyr.

Karabag ipəq tresti çok bɵjuq olmajan 5 zavody işlətməqdədur qi, hamьsьnьn bir jerdə 350 tijanь vardyr. Bynlarьn ən bɵjuqləri Stepanaqertdə və Hadrytdadyr. Zavodlarьn bir hissəsi icarəjə verilmiş, bir hissəsi isə işləmir. Byndan başka hali-hazьrda Stepanaqertdə bɵjuq bir ipəq zavody tiqilməqdədur.

Butun zavodlarьn texniqi təchizatь heç də jaxşь halda dejildur. Ipəqçiliꞡi bərpa prosesi çok intensiv ꞡeçməsinə bakmajarak, Azərbajcanda barama məhsyly ancak bir az juqsəlmiş, hərbdən kabakqьnьn 60%-nə çatmьşdyr. Bynynla əlakədar olarak Azərbajcanьn ipəq açma sənajei uçun butun by illərdə ipəq xam malь çatmamьş və by noksan başlьca Ꞡurcistandan və kismən Turqistan və Irandan ꞡətirilən xam mal ilə tamamlanmьşdyr. By noksan ildən-ilə azalmakdadyr. Beş illiq plana ꞡɵrə Azərbajcanьn həm ipəqçiliꞡinin və həm ipəq açma sənajeinin inqişafь, məzqyr noksanь 1923-ci ildə tamam ortadan kaldьracakdyr.

1927-ci ildə Azəripəq və Karipəqdə 2,144 daimi işçi çalьşьrdь. 1928-ci ildə by mikdar 2,518 nəfərə kədər artdь, 1929-cy ildə isə 3250 nəfərə kədər çatacakdyr.



Şəqil-11. Qəpənəꞡin baramadan çьkmasь, solda dişi qəpənəq baramadan çьkьr, sagda içərisindən ərqəq qəpənəq çьkmьş, deşiq barama (şəqillər təbii bɵjuqluqdədur).

Trestlərin ən muhum istehsalatь (kijmətli bir məhsyl olan sortovi nəzərə almajarak) grez—jə'ni baramadan açьlmьş ipəqdur.

Hər il istehsalat artmakdadyr.

1927-ci ildə—6,803 min manatlьk, 1928-ci ildə 8,627 min manatlьk istehsalat hazьrlanmьşdyr, 1929-cy ildə—11,230 min manatlьk hazьrlanacagь təsəvvur edilməqdədur.

Xam ipəꞡin işlədicisi deməq olar qi, jalьnьz devlət; ipəq sənajeidur. Ipəq açan zavodlarь istehsalatь bazarda sərbəst syratdə tədavul etməqdədur. Ona ꞡɵrə də bynlar kabakcadan Umym Ittifak tokycylyk Sindikatьna satьlьr. Ancak Istehsalatьn az bir hissəsi 2-ci və 3-cu sort ipəq—kooperativ, əl sənətqarlarь və devlət təşqilatlarьna satьlmakdadyr.

Xam ipəq, Şyralar Ittifakь bazarьnda ꞡeniş syrətdə satьldьgьndan xaricə ꞡɵndərilməjir.



## IV. QƏNƏF, QƏNDIR

Şyralar Ittifakьnьn ən muhum ipliq bitꞡilərindən biri olan qəndirin ən ꞡuclu rəkibləri, cənyb tropiq və sybtropiq bitꞡiləri olan cyt (Hind qəndiri), manil, Jeni Zeland qəndiri (kanat) və qənəfdur. Kanat, qəndir, cijə və cur-bə-cur qobyd və bə'zən zərif tokymalar (və ən çok meşok tokymalarь) kajrьlan by ipliq bitꞡiləri sьrasьna, Turqistan qəndirini də ilavə etməq lazьmdyr.

Jykarьda sajьlan bitꞡilərdən ticarətdə xusysən ibriləjəni cyt və qənəfdur. Qənəf və qəndir iklim şərtləri nɵktəji-nəzərindən Azərbajcan uçun tamamilə əlverişlidur.

Qəndirin lifi syda çurumaməqlə və xusysilə tor ɵrməꞡə və kanat eşməꞡə əlverişli olmakla tanьnmьşdyr. By səbəblə də qəndir bɵjuq bir əhəmijjət kazanmьşdyr. By bitꞡi Turqistanda, Cejhyn çajь kьraklarьnda jabanь halda bɵjuq sahələr dytmyşdyr.

Qənəf çokdan-bəri Cənybi Asjada əqilməqdə və oradan Inꞡiltərəjə ꞡɵndərilməqdədur. Qənəf ilə ən çok maraklanan Ykrajna Tokycylyk Tresti olmyşdyr. By trest 1924-cu ildə „Qənəf" şəhmdarlar cəmijjəti tə'sis etmişdur. Cəmijjətin başlьca məksədi qənəf əqinlərini ꞡenişlətməqdur. Azərbajcanda qənəf ziraəti təcribələri tamamilə jaxşь nəticələr vermişdur, 1926-cь ildə bircə Kyba kəzasьnda-55 heqtar sahəjə qənəf əqilmişdur. 1926-cь ilin təcribəsi 1927-ci ildə də təqrar edildi və by syrətlə Azərbajcanda (Kyba və Myganda) 240 heqtar sahəjə qənəf əqilmiş oldy.

Qənəf ziraətinin inqişafьnda toxym məsələsi də muhum jer dytmalьdyr. Gərbi qurdistanьn aranlьk jerləri lifdən ɵtru qənəf ziraətinə nə kədər əlverişli isə, Azərbajcan da toxym işlərinin inqişafь uçun bir o kədər əlverişlidur.

Jerlərdən ꞡɵstərilən istəqlərə ꞡɵrə, by jakьn illərdə Azərbajcanda 1.000 heqtarlьk qənəf sahəsi təşqil edilə biləcəqdur.

Kabakca sɵjlənildiꞡi uzrə, Baqьda qənəf fabriqi tiqilməꞡi lajihəjə alьnmьşdyr.

### MƏCBYRI ƏDƏBIJJAT

Mixajьl Avdejevin məkaləsi „Azərbajcan qənt təsərrufatьnьn bərpa və inqişafьnьn qələcəq planьnda ipəqçiliq".
1926-cь il təb'i, Baqь, səhifə 401-423.

### KONTROL IŞLƏRI UÇUN MEVZY

Aşagьda iş materialьndaqь məsələləri fiqirləşin və təhlil edin:

1) Azərbajcanda. Zakafkasija federasijasьna və orta Asjaja nisbətlə pambyk əqini sahəsi necə dəjişilmişdur?

2) Azərbajcan Sosjalist Şyra Cumhyrijjətinin pambykçylyk tarixini təsvir edin.

3) Azərbajcanda pambykçylygyn bərpasь və inqişafь uçun Şyra hɵquməti tərəfindən nə edilmişdur və nə edilməqdədur?

4) Azərbajcanda kojyncylygyn inqişafь uçun əlverişli olan şərtlər nələrdən ibarətdur?

5) Azərbajcanda Şyra hɵquməti kyrylandan-bəri kyrt toxymy və baramaçьlьk nə curə inqişaf etmişdur?

### KONTROL SYALLARЬ

Aşagьdaqь syallara təhriri şəqildə cavab ve In:

1) Pambyk nədur, pambyga nə şəçilbə təsaduf olynyr, pambyk qo'y nə məksəddən etru əqilir?

2) Şyralar Ittifakь pambyk hasilatыnda hansь jeri dytyr və hansь devlətlərdən ƣeridədur?

3) Pambykçylykda kooperasja nə rol ojnajьr?

4) Sizin rajonynyzda (kəza, dajirə və ja qəndinzdə) neçə heqtar pambyk əqilir? Axьrьncь illərdə pambyk əqini sahəsi ƣenişlədimi, ƣanişləmədi isə nə uçun ƣanişləməmişdur?

5) Pambygyn işlənməsi hansь ogerasijalara ajrьlьr, cin-maşьn nədur?

6) Azərbajcanda hansь pambyk təmizləjən zavodlar, hansь tokyma fabriqləri vardyr və jakьn beş ildə hansьlarьnьn açьlacagь nəzərə alьnmьşdyr?

7) Azərbajcan kojynlar ilə jaxşь tə'min edilmişmidur?

8) Hequmət nədən etru „merinoslara" əhəmijjət verir?

9) Dunja ipeqçiliƣinin mərqəzləri hansьlardyr və ipəqçiliq Azərbajcanьn hansь kəzalarьnda ən çok inqişaf etmişdur?

10) Azərbajcanьn ipəq açma sənajeinin nə haldə oldygyny təsvir edin.

### MƏSƏLƏNI DAHA DƏRINDƏN ƏƢRƏNMƏQ UÇUN

### GEJRI MƏCBYRI ƏDƏBIJJAT

„Хлопок" изд. „Пучина" Москва. Петровские линии 1/20, ц. 69 коп.
„Шерсть" „ „ „ „ „ 60 „
А. и О. Тихомировы „Учебная выкормка шелковичного червя".
Дубенский „Очерки по экономгеографии Закавказья" Тифлис, 1924 г, изд. Краевого Комитета РКП (б), стр, 202—209.
„Экономический Вестник Азербайджана".
За 1926 г. № 5—6, № 3.
За 1925 г. №10—11
За 1927 г. №6, №', № 11
За 1928 г. №2—3, №5—6. №7—8
„Экономический Вестник Закавказья"
За 1927 г., №8.
За 1928 г., №17, №18, №8, №12.

*VI-VƏZIFƏ.*

# MƏ'DƏN, IŞLƏMƏ VƏ KYSTAR SƏNAJEI

## Vəzifənin mundəricatь.

Mə'dən sənajeinin əhəmijjəti, mis və mis sənajei, ququrt kolçedanь, barit və Çovdar-barit sənajei, Zəƣliq zəq zavody, Qirəc daşь, ƣil və çimento zavody, dyz və dyz sənajei, dəmir və Daşqəsən məsələsi, gejri kazьntьlar, mineral mə'dənləri, işləmə sənajeinin umymi icmalь, yn ujutmə, duju təmizləmə sənajei, mexaniq zavodlar. Baqь Şyrasьnьn dəri, bijan qequ, tutun, poligraf, şişə və jerli sənajei, ag qemur və kystar sənajeinin elektrikləşdirilməsi, onyn tə'rifi və əhəmijjəti, kystarlarьn umymi mikdarь və ixtisaslara belunməsi, kystar və sənətqar kooperasijasь, kystar sənajeinin ajrь-ajrь nevləri, daxili və xarici ticarət.

## A. VƏZIFƏJƏ AJID İZAHAT.

## 1. MƏ'DƏN SƏNAJEI (NƏFT DAXЬL DEJILDUR).

### 1. Azərbajcan uçun mə'dən sənajeinin əhəmijjəti.

Azərbajcan kazьntьlar ilə zənƣindur, ona ƣerə də təbii olarak Azərbajcanda mə'dən sənajei inqişaf edə bilər və etməlidur. Kabakca satьş bazarь olan və hali-hazьrda enerƶili bir syrətdə kyrylyş devri qeçirən Azərbajcan, ez xam mallarь və zənƣin mə'dənləri olmagьna ƣerə, jalьnьz ez ehtijacь uçun dejil, hətta ixracat uçun də istehsalçь bir elqə olmalьdyr.

Azərbajcanьn mis, çinko, ƣumuş, kyrşyn, dəmir, manganez, ququrt kolçedanь, barit, ququrt, kobalt və gejri qibi hamь fajdalь kazьntьlarь şyra heqyməti zamanьna kədər xusysi maliqijjətçilər əlində idi. Neft sənajei, devlətli olmak uçun diƣər mə'dən zavod işlərinə nisbətlə daha junƣul və daha kьsa usyllar verdiƣindən kapitalistləri hər şejdən çok maraklandьrьr və by syrətlə neft sənajei daha az kazanclь olan başka kazьntьlara kojylacak kapitalь ezunə çəqirdi. Kabakca işlədilən mə'dən jataklarьnьn və by jataklarda kyrylan zavodlarьn Azərbajcanьn şyralaşdьrьldьgь andaqь acьnacaklь hallarь da byny təsdik edir. By muəssəsələrdəqi təchizat qehnəlmiş, mə'dən ocaklarь pis kyrylyşly, xam mal və materijal jok idi. Mə'dən jataklarьnьn ezu ejrənilməmiş olyb deməq olyr qi, heç bir araşdьrma da aparьlmajьrdь.

Byndan başka elqələri jalьnьz Rysja sənajeinin satьş bazarьna çevirməƣə çalьşan qehnə hequmətin mustəmləqəçiliq sijasəti, by

ɵlqələrdə, və o cumlədən Azərbajcanda mə'dən işlərinin inqişafьna ;ol verməjirdi.

Imperializm və vətəndaş muharəbələri mə'dən işlərini həddən artьk çətinləşdirdi.

Azərbajcanьn mineral çəquntulərinin qəmijjət və qejfijjətini tə'jin etməq çətindur. Çunqu bynlar axьr zamana kədər tədkik edilməmişdur, bynlarь hər tərəfli tədkik və araşdьrma lazьmdyr.

Hali-hazьrda Azərbajcanьn butun mə'dən sənajei, Azərbajcan mə'dən sənajei trestinin ixtijarьndadyr.

1927-28-ci illərin başlangьcьnda trestə aşagьdaqь muəssəsələr daxьl idi: Ǫedəbəj mis əritmə zavody, Çьragьzor ququrt kolçedanь mə'dən ocaklarь, Zəǫliq zəǫ zavody, barit mə'dən ocaklarь və gejri.

## 2. Mis və mis sənajei.

Mis, ǫumuşdən sonra ən jakşь bir elektriq qeçiricisidur Elektrotexnikanьn çok bɵjuq tərəkkisilə əlakədar olaraк, mis xalk təsərrufatьnda ǫet-ǫedə daha bɵjuq əhəmijjət kazanmakda və onyn istehsalь ǫet-ǫedə artmakdadyr. Dunja mis istehsalьnьn ən muhum hissələri Amerikada və xusysilə Şimali Amerika Muttəhid Ştatlarьnda mərqəzləşmişdur. Butun dunja istehsalьnьn 60%-i Ş. A. Muttəhid Ştatlarьnьn hissəsinə duşməqdədur. Şyralar Ittifakь, mis istehsalьnda, ǫɵrqəmli jer dytan devlətlər cərǫəsinə daxьl dejildur, ancak Şyralar Ittifakьnda da mis istehsalь sur'ətlə artmakdadyr.

Bizdə mis istehsalь inkilabdan kabak oldygy qibi hali-hazьrda da sənajeimizin ehtijacьnь ɵdəjə bilməjir və biz bir mikdar mis xaricdən ǫətirtməǫə məcbyr olyryk. Mis metalь jataklarь muhum mikdarda Sibirdə, Yralda və Zakafkasja federasijasьndadyr.

Azərbajcanda mis jataklarь: 1) Zakatala kəzasьnьn Balaqən qəndində, 2) Vankly qəndi cəvarьnda 3) myxtar Daglьk Karabag əjalətində, Tərtərdə Mehman qəndindən yzak olmajan Ǫuljatakda 4) Ǫəncə kəzasьnda Ǫedəbəjdədur.

Balaqən jatagь araşdьrьlmьş və jaxşь nəticə vermişdur. Myxtar Daglьk Karabag əjalətinin hər iqi qəndinin cəvarьndaqь jatak isə hələ qi araşdьrьlmamьşdyr.

Ǫedəbəjdə, Ǫedəbəj mis əritmə zavody vardyr. Hali hazьrda byrada mis mə'dəni ehtijatь azalmьşdyr. Byna bakmajarak ǫedəbəj zavodynda mis istehsalь ildən-ilə artmьşdyr. 1923-24-cu illərdə 90,69 ton, 1925-26-cь illərdə isə 221,28 ton mis istehsal edilmişdur. 1926-27-ci ildən mə'dən sənajei tresti araşdьrma işi aparmьş və zavody iqi il tə'min edə biləcəq kədər mis ehtijatь oldygy mejdana çьkmьşdyr. Ǫedəbəj rajonynda bir kədər daha mis ehtijatь tapьlacagьna ymyd vardyr.



## 3. Ququrt kolçedanь.

Azərbajcanda ququrt kolçedanь jataklarь kismən mis jataklarilə (Ǫedəbəjdə) əlakədardyr, kismən isə mustəkildur (Çьragьzor). Çьragьzor Ǫəncə kəzasьnda Çajqənt qəndinin jakьnlьgьndadyr.

Sulh zamanьnda kolçedana olan bɵjuq tələb xaricdən ǫətirilən kolçedan ilə tə'min edilirdi Kolçedan ən artьk Ispanjadan ǫətirilirdi, çunqu Rysja kolçedanь kijmətcə Ispanja kolçedanь ilə rəkabət edə bilməjirdi. Hali-hazьrda biz Şyralar Ittifakьnьn butun kolçedan ehtijatьndan istifadə etməlijiq. Qimija sənajeinin sur'ətlə bərpa edilməsinə və by sənaje'də ən muhum amilin ququrt tyrşysy olmasьna ǫɵrə ququrt kolçedanьna olan tələb sur'ətlə artmakdadyr. Ququrt kolçedanь (ququrt tyrşysy reaktivi), başlьca Azərnəftə ǫətirilir. Azərnəftdə ildə 9.600 ton kolçedan işlədilirdi.

Hər iqi mə'dən ocagьndaqь kolçedan istehsalь aşagьdaqь rəkəmlər ilə ifadə olynyrdy:

| | 1913-il | 1916-il | 1925/26-il |
|---|---|---|---|
| Çьragьzor | 2526000 qlg | 3935600 qlg | 7490736 qlg |
| Ǫedəbəj | 2323600 „ | 3419920 „ | 8696384 „ |
| | 4849600 „ | 7355520 „ | 16187120 „ |

1926/27-ci illərdə hər iqi mə'dən ocagьnda 8563200 qlg

Azərbajcan kolçedanьnьn ən ciddi rəkibi Yral kolçedanь.dyr. Yralьn kolçedan jatagь çok bɵjuqdur və əsas dəmir jol şəbəqəsilə rabitəli olmagьna ǫɵrə Yral kolçedanь Azərbajcanьnqьndan oldykca ycyz başa ǫəlir.

Bazar vəzijjəti hali-hazьrda Azərbajcan uçun çətinləşir və kolçedanь işlədəcəq muəssəsələrdən yzak olmagьna ǫɵrə bir o kədər jakşь dejilsə də, ancak indi onyn kabagьnda jeni sahə açьlmakdadyr: Ǫəncədə ququrt tyrşysy zavody açьlmasь təsəvvur edilməqdədur qi, by ququrt tyrşysyndan da ǫələcəqdə açьlacak jod zavody istifadə edəcəqdur.

Hali-hazьrda Azərnəft tərəfindən kazma sylarьndan çok mikdarda jod istehsalь təsəvvur edilməqdədur, və by istehsalatьn jakьn ǫələcəqdə Azərbajcan kolçedanьnьn bɵjuq mikdarda ymydly işlədicisi olacakdyr.

Ququrt kolçedanь ehtijatь Ǫəncə kəzasьnьn Çovdar qəndinda tapьlmьşdyr.

## 4. Barit və Çovdar bariti sənajei.

Jatagь mə'lym və Ittifakьmьzda qafi mikdarda mevcyd olan və hərbdən əvvəl ja busbutun işlənməjən və ja çok az mikdarda işlənib by barədəqi ehtijac xaricdən ǫətirilərəq tə'min olynan kazьntьlardan biri də barit (agьr şpat) dyr. Barit, boja sənajeində ag rənǫ litopon kajьrmakdan ɵtru və byndan başka rezin, linɵle-

ym və gejri istehsalatьnda qeniş syrətdə işlədilir. Şyralar Ittifakьnьn bir çok jerlərində barit jatagь vardyr. Laqin bynyn başlьca ehtijatь Azərbajcandadyr.

Hərbdən əvvəl barit sistematiq olarak jalьnьz Qurcustanda istehsal edilirdi. Bə'zi illər barit Qəncə gybernijasьnda (Nemsə kolonjasь Annenfeld cəvarьnda) da istehsal ədilirdi. 1919-dan 1923-cu ilə kədər Şyralar Ittifakьnda barit heç istehsal edilməmişdur.

Azərbajcanda iqi barit jatagь rajony vardyr (Qəncə kəzasьnda Çovdar və Kyççy). Bynlarьn sənaje əhəmijjətləri olmasь şubhəsizdur. Muəjjən şərtlər daxilində həmçinin sənaje əhəmijjəti kazana biləcəq uçuncu rajon isə Zəqəm stansijasьndan 11 qilometro məsafədə Irmaşlь qəndi həvalisindədur.

Hərbdən əvvəl baritə olan ehtijac ildə 16000 tona kədər çatьrdь, və biz by ehtijacь deməq olar qi, jalьnьz xarici bariti ilə ədəjirdiq. Şyralar Ittifakьnda baritə olan ehtijac artmakla baritə xusysi dikkət verilmişdur. Çunqu baritin tamamilə satьlacagь və hətta kazancda verəcəqi mejdana çьkmьşdyr.

Çovdar barit jatagьnьn işlədilməsinə 1925-27-ci illərdə başlanmьş və by ildə 1534 tona kədər parça barit istehsal edilmişdur. Bariti ujudulmuş halda satmak, parça halьnda satmakdan daha çok əlverişlidur. Jakьn qələcəqdə Qəncədə barit dəjirməni işəsalьnacakdyr, by dəjirmənin təchizatь xaricə sifarьş edilmişdur. Mevcyd olan Çovdar sənajeinin texniq imqanьna qəlincə, bynlar kejd edilmiş artьk baritin istehsalь uçun hazьrlьklьdyrlar.

### 5. Zəqliq (Qəncə kəzasьnda) zəq zavody.

Zəqliq zəq zavody 1925-ci ildə tə'sis edilmiş və jenidən kyrmak məksədilə hali-hazьrda təchizatь dəjişdirilmiş olyb işlədilməqə başlanmakdadyr. Zavod iledə 576-ton zəq istehsal edə bilir qi by mikdar qeçmiş illərə nisbətən 5-6 dəfə artьkdyr. Zavodyn istehsal etdiqi zəqi satmak uçun qeniş perspektiv açьlmakdadyr. Rysja Sosjalist Koşma Şyra Cumhyrijjətində hazьrlanan sun'i zəq-tokycylyk sənajeində təbii zəqi əvəz edə bilməz. Θzumuzun təbii zəqimiz isə ehtijacьmьzь ədəjəmədiqindən Italjadan qətirtməqə məcbyr olyryk: Zəq materjallarь bojamazdan kabak zənqab olarak işlədilir.

1923—24-cu ildə zəqliq zavodynda 83200 qilogram zəq istehsal edilmişdi. 1927-28-ci ildə beş illiq plana qərə zavod ilavə təchiz edildiqdən sonra istehsal 1152 tona çatmalь idi.

Zəqliq zəq daşьndan aluminiym almak məsələsi muzaqərədevrəsində bylynmakdadyr.



### 6. Qirəç daşь və qil. Çimento zavodlarь.

Azərbajcanьn çimento sənajei, Azərbajcan çimento trestinin aşagьdaqь zavodlarьnda mərqəzləşmişdur: 1) Tavys stansijasь cəvarьnda Syltanov adьna devləti cimento zavody, 2) Qeşlə rajony jakьnlьgьnda Vorovsqi adьna devləti çimento zavody.

Əsaslь syrətdə təchiz edilməq sajəsində hər iqi zavodyn istehsalatь çok artmьşdyr:

ÇIMENTO ISTEHSALATЬ (TON HESABILƏ)

| Zavodlar | 1925—26 | 1926—27 | 1927—28 |
|---|---|---|---|
| Vorovsqi adьna Qeşlə zavody . . . . . . . . . . | 1536 | 1744 | 2400 |
| Syltanov adьna Tavys zavody . . . . . . . . . | 873 | 840 | 1920 |
| Jəqyn. . . | 2409 | 2584 | 4320 |

Çimento istehsalatь tamamilə jolyna kojylmyşdyr. Zavodlarьn byrakdьklarь çimentolar qejfijjət e'tibarilə Şyralar Ittifakь zavodlarьnьn ən jaxşь çimentolarьndan qeri kalmamakdadyr.

Çimentony işlədənlər başlьca devlət təşqilatlarь və kismən kooperasijalardyr. Azərbajcanьn by iqi zavodynyn istehsalatь maksimyma çatdьrьlsa belə, jakьn beş ildə Azərbajcan və Zakafkasjada aparьlmasь qözlənilən tiqinti işlərinə lazьm olan çimentony ədəjəməjəcəq və Şimali Kafkazdan çimento qətirtməqə davam olynacakdyr. Byna qərə də Azərbajcan çimento trestinin kabagьnda, jakьn illərdə hər iqi zavodyn istehsalatьnь artьrmak qibi muəjjən bir vəzifə dyrmakdadyr, by barədə lazьmi kədər xam malьn mevcyd olmasь, zavodlarьn mərqəzi binalarьnьn iqinci jakma ocaklarь uçun duzəldilə bilməsi və gejri qibi imqanlar da vardyr.

### 7. Dyz və Azərbajcanьn dyz sənajei.

Azərbajcanda dyz, daş və ja çəquntu halьnda olmak uzrə iqi şəqildə istehsal olynyr. Azərbajcan dyz trestinə iqi muəssəsə daxьldyr. bynlardan biri Əişaran jarьm adasь qəllərindən çəquntu dyzlarь çьkaran Azərbajcan qəl sənajei kontory və iqincisi Naxçьvan dyz mə'dənləri idarəsidur. Naxçьvan daş dyz jatagь, biri Lenin adьna və o biri 26 kommynarlar adьna olmak uzrə iqi mə'dəndən təşqil olynmyşdyr. Naxçьvan dagь cəvarьnda bylynan hər iqi mə'dənin dyz ehtijatь 80 miljon tona çatmakdadyr.

Naxçьvanьn dyz jatagь təbii- şərajit nɵktəji-nəzərindən jaxşь halda dejildur: dyz lajlarьnь ƣil və merƣel xьrda təbəkələri qəsməqdədur. By səbəblə dyzlar çirqli olyb itƣi fajizi çok olyr. 26-kommynarlar adьna olan mə'dən hali-hazьrda işləməjir.

Nəklijjə xərci hesabьna dyzyn otyryş kijmətini ycyzlaşdьrmak məksədilə Lenin adьna olan mə'dən uçun, dyzy mə'dəndən dəmir jol stansijasьna daşьmakdan ɵtru kanat jol tədaruq edilərəq duzəldilmiş və elektriq stansijasь kyrylarak işə salьnmьşdyr.

Çɵquntu dyzlarь iqi ƣɵldən çьkarьlmakdadyr. Bynlar da Masazьr və Bɵjuq-Şor ƣɵlləridur. Axьrьncь illərdə əm daş dyzynyn və həm çɵquntu dyzynyn istehsalь oldykca artmьşdyr. Məsələn: Naxçьvan daş dyz mə'dərlərindən 1924-də 18000 ton. 1926-da təxminən 37000 ton dyz istehsal edilmişdur. Ə'şьran ƣɵllərindən istehsal edilən çɵquntu dyz, 1924-cu ildə 4150 ton və 1926-cь ildə isə 31170 tondyr.

## 8. Dəmir və Daşqəsən problemi.

Hali-hazьrda Azərbajcan Sosjalist Şyra Cumhyrijjəti hɵqumәti, Ƣəncə şəhərindən cənyb-gərbə dogry təxminən 40 qilometro məsafədə bylynan Daşqəsəndə dəmir zavody kyrmaga bɵjuq dikkət verməqdədur. By magnitli demir daşь jatagьnьn ehtijatь lazьmьnca tədkik edilmiş və by ehtijatьn 190.000.000 ton oldygy tə'jin edilmişdur. Mə'dən ehtijatь bol və dəmir fajizi çok olan Daşqəsən jatagьnьn çok bɵjuq sənaje əhəmijjəti vardyr. Zakafkasija və Azərbajcanьn indijə kədər bir dənə də olsyn dəmir zavody jokdyr. Halby qi, xusysilə hɵqumətimizin dytdygy sənaje'ləşmə kyrsyny nəzərə alar isəq dəmir, çygyn və polada olan ehtijac çok bɵjuqdur. Byna ƣɵrə də lajihəjə alьnan Daşqəsən dəmir zavodynyn Azərbajcan iktisadijjatьnda nə bɵjuq rol ojnajacagь ɵz-ɵzluƣundən ajdьnlaşar. Dəmir kajьrma prosesinə lazьm olacak daş qɵmurun (koksyn) Ƣurcustan, Tiqvarçel daş qɵmur jatagьndan alьnacagь təsəvvur edilməqdədur.

## 9. Gejri kazьntьlar.

**Manganez**. Manganez ehtijatь, Ƣəncə kəzasьnda, Jelenendorf həvalisində Molla-Cəlilli və Yzyn-Təpədə vardyr. Hər iqi jatakdaqь manganez mikdarь, Ƣurcustan cumhurijjətindəqi məşhyr Çiatyr jatagьndan çok ƣeridədur. Hali-hazьrda, Azərbajcanda manganez sənajeinin inqişafь barəsində iktisadi mə'lymat jokdyr. Donets hevzəsinin və Yralьn manganez ehtijacь Nikopol (Ykrajnanьn cənybyndadyr) manganezi ilə tamamilə ɵdənməqdədur. Nikopol manganezi xaricə də ƣəndərilməqdədur. Azərbajcan manganezinin xaricə ƣəndərilməsi barəsində danьşmak hələ qi, artьkdyr, çunqa- Azərbajcan manganezi, qejfijjətcə daha jaxşь və nəklijjat nɵkteji-



-nəzərindən Kara dənizə jakьn olmagьna ƣɵrə daha əlverişli cografi şərtlərdə bylynan Çiatyr manganezılə rəkabət edə bilməz.

**Kyrşyn.** Kyrşyn jatagь, Naxçьvanьn Ƣumuşluq qəndindədur. Inkilabdan əvvəl by jatak işlənmiş və umymijjətlə təxminən 255 ton kyrşyn alьnmьşdyr. Inkilab zamanьnda zavodyn hamь təchizatь və məsqənlər xarab edilmişdi By jatak indijə kədər ətraflь bir syrətdə tədkik edilməmişdur. Byna ƣɵrə də by jatagьn sənaje əhəmijjəti barəsində bir kərar jokdyr.

**Çinko**. Mehmandaqь çinko jatagь yzak qeçmişdə və sonra inkilab başlamazdan kabak kьsa bir zaman işlənmişdur. Mehmanьn sənaje əhəmijjəti indijə kədər ajdьnlaşdьrьlmamьşdyr. Sənaje əhəmijjəti olacagь ƣuman edilən by jatagьn karakter və ehtijatьnь muəjjən edəcəq araşdьrma aparьlmasь lazьmdyr.

**Kobalt.** Jer uzərində kobalt olan jerlər azdyr. Şyralar Ittifakьnьn çini və porselan zavodlarь uçun hər il 16 ton kobalt oksidi lazьmdyr qi by, Inƣiltərə və Almanjadan ƣətirilməqdədur. Ondan başka, maşьn inşaatьnda bir çok hallarda əvəzi bylynmajan stellit (by istehsalat, Leningradda „kьzьl Pytilovçy" də vardyr) xəlitəsi hazьrlanmagьna ƣɵrə, kobalt ƣet-ƣedə artьk əhəmijjət kazanmakdadyr.

Kobalt Daşqəsəndə vardyr. Byrada bir zamanlar kobalt istehsal edilmişdi. 1901-ci ildən kobalt istehsalь qəsilmiş və sonra jenidən başlanmamьşdyr. Daşqəsəndə kobalt kalmamьş oldygyna hɵqum etməƣə heç bir əsas jokdyr. Hər ƣah araşdьrьlarsa, byrada kobalt mə'dəni jyvasь tapmak ehtimalь vardyr.

**Ququrt.** Ququrt mə'dəni Naxçьvarda Ƣumurdə vardyr. Byrada jetmişinci illərdə az mikdarda ququrt istehsal edilmişdur. Muharəbə zamanьnda byrada araşdьrma başlanmьş isə də inkilab başlanmasilə by dajandьrьlmьş və by işlərin nəticəsi mə'lym olmamьşdyr.

Zakafkasja federasijasь qənt təsərrufatьnьn ququrt çiçəƣinə çok ehtijacь vardyr. Byna ƣɵrə də by jataga dikkət jetirib araşdьrma başlajarak istehsalatь kyrmaga və by syrətlə Zakafkasja bazarlarьndan, xaricdən ƣətirilən ququrdu sьkьşdьrmaga ehtimal vardyr.

**Arsenik.** Cylfa rajonynda Dagrь-Dagda və gejri jerlərdə arsenik jatagьnьn bylyndygyna dajir nişanələr vardyr və bynlardan bir paralarь Iran haqimijjəti zamanьnda kystar syrətdə işlənmişdur. Şyralar Ittifakь həmişə xarici arsenikdən istifadə etmişdur. Hərbi işlərdə arsenikin xusysi əhəmijjəti olmagьna və başka məksədlərdə də işlənməƣinə ƣɵrə jykarьda sɵjlənilən jataklarь istər qejfijjət və istər qəmijjət e'tibarь ilə ajdьnlaşdьrmak təsəvvur olynyr.

**Azbest.** Azbestə olan tələb hər bir ɵlqədə ƣundən-ƣunə artmakdadyr. Çunqu azbestin ƣərəq sənaje və ƣərəq texnikanьn muxtəlif sahələrində işlədilməsi ƣet-ƣedə artmakdadyr. Daxili ba-

zarda da azbestə olan ehtijac hiss edilməqdədur. Azbest xam şəqildə xaricə qəndərilə bilər. Azbest jatagь Şyşanьn jakьnlьgьnda Tyrş-Sydadyr. By jatagьn sənajeə nə dərəcəjə kədər əlverişli oldygyny qeoloziq araşdьrmalar ilə tə'jin etməq lazьmdyr.

**Koalin**. Koalinə Çovdar həvalisində təsaduf edilməqdədur. By koalinin numynələrьnin xarici şəqlinə bakьlьrsa, byny ən jaxşь sortlardan hesab etməq lazьm qəlir, ancak by koalin qimijəvi cihətdən hələ qi, tədkik edilməmişdur.

**Cibs**. Bizdə cibs jatagь, Qəncə kəzasьnda Jykarь Hacьqəntdədur. Azərbajcanda inşaat işlərində cibsə ehtijac hiss edilməqdədur. By jatak tədkik edilməmişdur.

## 10. Mineral mənbə'ləri.

Jerin dərinliqlərində bylynan təbii zənqinliqlər arasьnda muhum jerlərdən birini də mineral mənbe'ləri və ja mineral sylarь dytyr. Hali-hazьrda mineral sylarь, butun əlqələrdə, insanlarь bir çok xəstəliqlərdən xulas edən muhum bir mualəcə vasitəsi olarak qeniş syrətdə işlədilməqdədur. By mənbe'lər adi içmə sylarьndan minerallaşmьş olmalarь ilə ajьrd olynyrlar, jə'ni mineral sylarьnda bromly, jodly, xlorly, ququrtlu və karbonly birləşmələr, kalsiym, natriym, magneziym, dəmir, qirəç və gejriləri vardyr. (Təbabət nəkteji-nəzərindən) əzlərindəqi by və ja başka mineral dyzlarьn daha çok əhəmijjətli olmagьndan asьlь olarak mineral sylarь aşagьdaqь gryplara ajrьlьr:

1) kələvi sylar,
2) dəmirli sylar,
3) acь sylar,
4) ququrtlu sylar,
5) xərəq dyzly sylar.

Mineral sylarьnьn çoky jerdən isti halda çьkьr. Bynlarьn istiliqləri Reomur ilə çok zaman 60—70° və daha artьk gradysa çatьr. Laqin bynyn əqsi olarak Reomur ilə 4°-a kədər sojyk olan mənbe'lər də vardyr.

Mineral mənbe'ləri çok muxtəlif syrətlərdə işlənir: bir para mənbe'lərdə çimirlər, bir para mənbe'lərin syjyny içirlər. Həm sylarь içilən və həm də çimilən (məsələn: narzan qibi) mənbe'lər də vardyr. Bir çok mənbe'lərdən jalьnьz mənbe'lərin bylyndyklarь jerlərdə dejil, yzak jerlərdə də istifadə olynyr.

Mualəcə mənbe'lərindən danьşdьkda, mualəcə palçьklarь barəsində də bir neçə səz səjləməlidur. Mualəcə palçьklarь dejə, qəl, çaj və gejridə çəquntu halьnda bylynan minerallaşmьş lilə dejilir. By palçьklar vanna şəqlində ja butun vucyda və ja vucydyn bir hissəsinə xarici mualəcə vasitəsi olarak işlədilir. Adəta palçьklar çok kьzdьrьlmьş halda işlədilir və ja qunəş şua'larь ilə



kьzmьş palçьklardan istifadə olynyr. By cur palçьklar da mineral mənbe'ləri qibi dunjanьn hər tərəfinə jajьlmьşdyr.

Azərbajcanьn çok bol mineral mənbe'ləri və bir çok kyrort jerləri vardyr. By mənbe'lərdən çoky tədkik edilməmişdur, bynlarьn çokyndan istifadə edilməməqdədur. Hətta Azərbajcan əhalisi arasьnda by kədər məşhyr olan, Kyba kəzasьndaqь Xaltan, Şamaxь kəzasьndaqь Zərqah və Çyxyr-Jyrt mənbe'ləri qibi mənbe'lər belə indijə kədər ibtidai halda bylynmakdadyr.

Azərbajcanlьlar arasьnda Qurdustan və Lənqəran mənbe'ləri bəjuq əhəmijjət kazanmьşlardyr. Qurdustan kəzasьnda: Nyrəddin -narzan (Kotyrly dajirəsində) kotyrly-narzan (Minqəntli dajirəsində) Minqəntli ыlьk sy mənbe'ləri vardyr. Laqin Tərtərdə, Qulbəcər dajirəsindəqi Isti-sy mənbəi bəjuq şəhrət kazanmьşdyr, mənbeə Kafkazьn hər tərəfindən ildə minlərcə xəstələr qəlir. By mənbe'dən jer uzunə 5 miljon litrəjə kədər isti sy çьkmakdadyr. By mənbe əz syjynyn xasijjəti e'tibarilə məşhyr Karlsbad Şprydelinə musavidur. Syjynyn çok bollygy bylyndygy jerin jollarьnьn jaxşьlьgь və syjynyn tərqibi e'tibarь ilə Isti-sy Şyralar Ittifakьnda jeqanə bir mənbe'dur. By mənbein jalьnьz dar jerli mikjasda dejil, butun Ittifak mikjasьnda əhəmijjət kazanacagь ymyd edilə bilər.

Lənqəran kyrortlarь çokdan bəri vardyr. Bynlarьn çok qəzəl sybtropiq təbiət və bitqiləri, ildən-ilə bir çok xəstələri cəlb edir. Lənqəran kəzasьnda Jykarь Əndican və Ərqəvan adьnda iqi gryp mineral mənbe'ləri vardyr.

Jykarь Əndican mənbe'ləri Lənqəranьn gərb tərəfində 12 qilometro məsafədə daglьk jerdədur. Bynlar 10 dənə, ququrtlu, minerallaşmьş mənbe'dur. By mənbe'lər jerin uzunə çьkьr və qundə 100.000 vedrə sy verir. Hali-hazьrda jalьnьz 6 mənbe'dən istifadə edilir. Bynlar qundə 40.000 vedrə sy verirlər. Mənbe'lərin jakьnlьgьnda təpələr ilə ihatə edilmiş bir mejdançada 100 jataklь bir sanatorja tiqilmişdur. Byrada bir sezonda 1000 nəfərdən artьk mualəcə olyr.

Ərqəvan mənbe'ləri Prişib qəndinin cənyb gərbində 25 qilometro məsafədədur. Bəjuq və az çok tədkik edilmiş mənbe'lər uçdur. Bynlar qundə 150.000 vedrə sy verirlər. Mənbe'lərin dad və temperatyrlarь muxtəlifdur. Mualəcədən ətru indiliq jalьnьz birindən istifadə olynyr. Çunqu diqər iqisindən istifadə etməq uçun kabakca bir para işlər lazьmdyr. Lənqəran sylarьndan daha az kijmətli və daha az zənqin olmajan Ərqəvan sylarьnda mualəcə ibtidaji usyllar ilə aparьlmakdadyr.

Əfşaranda bylynan bir çok qəntlər də kyrort jerləri sьrasьna daxьl edilə bilir. Bynlardan ən məşhyrlarь jarьm adanьn şimal-gərbi sahili bojynca dizilmiş Bizovna, Mərdəqan, Pirşagь, Məştagьdyr. By qəntlərə jaj fəslində Baqь camaatь qutlələr ilə qedirlər.

Bizovna və Mərdəqanda bir çok jaxşь təşqil olynmyş istirahət evləri vardyr. Bizovna sumuq tyberqulozyny mualəcə etməq uçun 50 jataklь bir yşak sanatorijasь vardyr, daha 120 jataklь bir sanatorija dəxi tiqilməqdədur qi, by butun Zakafkasjada birinci sanatorija olacakdyr. Ǫøzəl pljaƶ, bol ǫunəşli ǫunlər, dəniz havasь, dəniz vannasь butun bynlar, by rajony bøjuq mualəcə əhəmijjəti olan bir jer hesab etməǫə əsas təşqil edir.

Ən son tədkikata ǫørə Əfşaranda kyrort uçun ən əlverişli jerin Høvsan oldygy anlaşьlmьşdyr. Høvsanda quləqlər azdyr. Syraxanьdan 7 qilometro məsafədədur. Høvsanda ququrtlu dyzly sy vardyr. By sy tərqibi e'tibarilə məşhyr Matses syjyna musavidur.

Syraxanьda ququrtlu sy mualəcəxanasь vardyr. Byrada bir çok xəstələr mualəcə olmakdadyr.

Syraxanьda Bøjuq-Şor ǫølundə çokly mualəcə palçьgь çəǫuntusu vardyr. Azərbajcanda mualəcə və kyrort əhəmijjətləri olan by sajьlmьş jerlərdən başka bir çok jerlər vardyr. Bir çok kəzalar hələ qi, tədkik olynmamьşdyr. Halby qi, by barədə onlar çok maraklьdyr.

Ǫəncənin cənybində 35 qilometro məsafədə çok ǫøzəl bir dag ǫølu olan Ǫøǫ-Ǫøl, by cur kyrort jajlaklarьndandyr. Ǫøǫ-Ǫøl kalьn meşəliq içində olyb çok şairanə bir mənzərə təşqil edir. Şəqi kəzasьnьn əzəmətli mənzərəsilə tamaşa edənləri hejrətdə byrakan daglarьnь da Azərbajcanьn jaxşь iklimli jerli sьrasьna daxьl etməlidur. Şyşa və Stepanaqert dəxi belədur. Şyşa dəniz uzundən 1.400 metro juqsəqliqdədur. Kyrydan artьk dəniz temperatyryna oxşar muntəzəm bir temperatyry vardyr. Şyşanьn oldygy jer, sьk meşəli daglar ilə çevrilmiş bir duzənǫahdyr qi, mənzərəsinin ǫøzəlliǫilə bir tabloja oxşar.

Stepanaqertin bylyndygy jer Şyşadan alçakdyr. Byna ǫørə də jagmьrlarь az, havasь mø'tədil və kyry, hər tərəfi meşə, iklimi jymyşak, muntəzəm və quləqsizdur. Stepanaqert bir neçə il ərzində ikliminin jaxşьlьgьna şøhrət kazanmьşdyr. Byraja daha hərbdən əvvəldə bir çok tyberqulozly (vərəmli) turq, erməni camaatь və Baqь işçiləri ǫedərdi.

## II. IŞLƏMƏ SƏNAJEI (TOKYMAÇЬLЬK DAXIL DEJILDUR).

### 1. Umymi icmal

Azərbajcanьn neft və tokymaçьlьkdan baqka muxtəlif sahələrdə bir çok işləmə sənajei vardyr. Laqin əvvələn: bynlarьn çok hissəsi qiçiq mikjasdadyr, iqincisi—ǫərəq ajrь-ajrь sahələrə ǫørə və ǫərəq ølqənin muxtəlif rajonlarьna ǫørə mutəsavi dejildur. Umymijjətlə isə Azərbajcanьn işləmə sənajei xьrda, sənət kystar tipində istehsalatdan iri, fabriq-zavod tipli istehsalata qeçid devrində bylynmakdadyr. Bynynla barabar ølqədə iri, zavod senajei istehsalatь da vardyr.



Azərbajcanьn işləmə sənajei: yn ujutmə və duju təmizləmə stehsalatь, tutun, poligraf, metal, şişə, ǫøn və bijan qequ sənajei sahələrindədur.

### 2. Yn ujutmə və duju təmizləmə istehsalatьndan başlajak.

Yn ujutmə sənajei, jalьnьz taxьl və yny ycyz kijmətlə daşьmak mumqun oldygy zaman inqişaf edə bilər. Rysjada əmtiə tipli bøjuq dəjirmənlərin Volga, Don qibi nəklijjata əlverişli çajlar və dəmir jollarь cəvarьnda kyrylmyş olmalarь da bynynla izah olynyr. Çərəq və yn ilə operasijalarь nəklijjə xərclərindən asьlьdyr. Nəklijjə xərci baha oldykda taxьl və ynyn, istehsal edilən rajonlardan istehlaq edilən rajonlara ǫətirilməsi çətin olyr. Sy jollarь ilə nəklijjə xərcinin ycyz olmasь və onynla rəkabət aparan dəmir jollarь Baqь rajonynda əmtiə tipli bøjuq dəjirmənlər kyrmaga imqan vermişdur. By rajonyn istehlaq rajony olmasь, Azərbajcanda yn ujutmə sənajeinin jaradьlmasьnda az rol ojnamamьşdyr.

Hərbdən əvvəl başlьca taxьl hazьrlama rajonlarь Şimali Kafkaz və Volga bojy vilajətləri idi. Hali-hazьrda da Baqьja taxьl ən çok Şimali Kafkazdan ǫətirilir.

1927-ci ilin 1 aprelindən e'tibarən devlət dəjirmənləri, Azərbajcan devlət yn tresti (Azyntrest) adlь altьnda, mustəkil yn ujutmə tresti olarak ajrьlmьşdyr. By trestin hej'ətinə 5 yn ujutmə dəirməni və 3 duju təmizləmə dəjirməni daxildur. Azyntrestin dəirmənlərindən başka bir dənə də Baqь Şyrasьnьn idarəsində duju təmizləmə dəjirməni vardyr. Baqьda əhəmijjətsiz mikdarda taxьl işləjən bir neçə dənə də xusysi şəxslərə ajid dəjirmən vardyr.

Azyntrest øz nizamnamasьnьn karakterinə ǫørə, øzǫələrinin taxьlьnь ujudən bir muəssəsə olyb, øzu taxьl hazьrlamaz. Duju təmizləjən zavodlara ǫəlincə, Şyralar Ittifakьnьn hamь duju təmizləmə sənajei tamamilə Azərbajcana ajiddur. Çunqu muqəmməl tipdə duju təmizləjən zavod jalьnьz Azərbajcanda, Baqьda vardyr. Astraxanda da duju təmizləjən zavodlar var isə də bynlar jarь kystar halda olyb istehsalatlarь da çok məhdyddyr. Baqь zavodlarьnьn işlədiqləri duju başlьca Irandan ǫəlir. Irandan başka Lənqəran Astara rajonlarьndan da çətliq ǫəlir. Təmizlənmiş duju Baqьdan RSKŞC-nə ǫøndərilir. Duju və çəltiq Baqьja jalьnьz dəniz joly ilə ǫətirilir.

Hər nə kədər yn ujutmə və duju təmizləmə muəssəsələrinin işlədiqləri taxьl və duju, bynlarьn istehsalat kabilijjətlərinə nisbət indijə kədər lazьmi mikdarda dejilsə də, ancak by muəssəsələ-

rin istehsalatь jenə də bɵjuq mikdara çatьr qi. byny aşagьdaqь cədvəl də təsdik edir.

| Illər | Ton hesabilə işlənən mikdar. |
|---|---|
| 1924—25 | 75862 |
| 1925—26 | 84548 |
| 1926—27 | 53326 |

1927-28-ci ildə işlənən taxьl mikdarьnь 1926—27-jə nisbətlə 30% artьrmak təsəvvur olynyrdy. Dujujə ƣəlincə, Iran ilə munasəbatьn tənzim edilməƣinə ƣɵrə duju idxalatьnьn 1927—28-ci ildə artьrьlacagь və duju təmizləjən zavodlarda işləmə mikdarьnьn ən azь 56 miljon qilogram olacagь təsəvvur olynyrdy.

### 3. Mexaniq zavodlar.

Baqь sənaje rajonynda 6 metal zavody vardyr. Bynlardan beşi (polat-çygyn mexaniq, çygyn-tɵqmə istehsalatь və gejriləri) işləməqdədur. Kalan biri isə xusysi olarak araba istehsalatь uçun yjgynlaşdьrьlmьş olyb, işsizdur. Butun by zavodlar Azərbajcan metal sənajeinə daxьl olmakdadyr. Ən iri muəssəsə, Kafkasijada bɵjuqluƣu ilə təq olan polat tɵqmə zavodydyr. Çygyndan polat əldə etməq uçun by zavodyn marten ocagь vardyr. Zavod, kazma instrymentləri uçun kalьb, adi və dirsəqli vallar, cur-bə-cur dişli çarxlar, tavalar, sindanlar, maşьn və motorlarьn hər bir hissəsi, tamam maşьnlar, paraxod vinti (pərvanə) və lobərləri, kazma instrymentləri, makkaslar, çevirmə dajirələri və gejri qibi muxtəlif qejfijjət və ɵlçudə cur-bə-cur fason və kalьb polat tɵqmələri hazьrlamakdadyr.

Işləməqdə olan zavodlar Baqь sənaje rajonynyn muxtəlif jerlərində oldyklarьndan 1924—25-ci ildə by zavodlarьn konsentrasijasь uçun əsaslь syrətdə çalьşmaga başlanmьş və by işin 1927—28-ci ildə kyrtarьlmasь təsəvvur olynmyşdy. Konsentrasija sɵjlənmiş zavodda aparьlmakdadyr. By zavodyn təchizatь muqəmməlləşdiriləraq və ƣenişləndiriləraq mevcyd olan və inqişaf etməqdə bylyn n Azərbajcan senajeini idarə etməq uçun vahid, ƣuçlu bir muəssəsə jaratmak imqanь əldə ediləcəqdur.

Azərbajcan metal sənajeinin hazьrladьgь ən muhum mə'lymat və jarь fabrikatlar bynlardyr:

| Mə'mylat | Ɵlçu vahid ləri | 1925—26 | 1926—27 | 1927—28 |
|---|---|---|---|---|
| Çygyn tɵqmə | Ton | 326,9 | 232,4 | 400,0 |
| Mis " | " | 9,1 | 9,6 | 20,0 |
| Polat " | " | 376,3 | 641,7 | 833,3 |
| Boçka dəzƣahlarь | Dənə | | | 84 |



Ƣɵrulduƣu uzrə Azərbajcan metal sənajei jalьnьz çygyn polat və mis. tɵqmə istehsalatьnь ƣenişlətməq dejil, (boçka-dəzƣahlarь qibi) xusysi işlər də ƣɵrur və by syrətlə şəhər və qənt bazarlarьna qɵməq edir. Azərbajcan metal sənajei mə'mylatьnьn kijməti 1926—27-ci ildə 615,9 min və 1927—28-ci ildə isə 1.331,9 min manat (216,2%) mikdarьnda tə'jin ediləməqdədur.

Metal zavodlarьnьn bazarlarь ancak Azərbajcanьn daxili bazarlarь və başlьca Baqьdyr. Əƣər son zamana kədər Azərbajcanda ƣeniş zavod mikjasьnda metallyrƣi (çygyn, dəmir, polat əldə etmə) və metal işləmə sənajeinin inqişafь uçun yjgyn istinadƣah olmadьgь nəzərə alьnarsa, vəzijjətin by cur olmasь təbii bir haldyr. By barədə, ancak Daşqəsən məsələsi tamamilə həll olyndykdan sonra danьşmak olar.

### 4. Ƣɵn sənajei.

Azərbajcanda ƣɵn sənajei Baqьdaqь 4 zavod tərəfindən aparьlmakdadyr. Bynlardan 2 dənəsi oldykca iri olyb, Ali Xalk Təsərrufat Şyrasьnьn „Azərƣɵn“ muəssəsəsi idarəsindədur, kalan iqi zavod isə Baqь Xalk Təsərrufat Şyrasьnьn əmrinə verilmişdur. By zavodlarьn təchizatьnь numynə olacak dərəcədə muqəmməl hesab etməq olmaz. Çunqu by zavodlar vətəndaş muharəbəsi devrində, maşьn ehtijacь butun Şyralar Ittifakь daxilində şiddətlə hiss edildiƣi bir zamanda tə'sis olynmyşdyr. Azərƣɵn zavodlarьnьn istehsalat kabilijjəti ajda 1500 iri və 10.000 qiçiq ƣɵn tə'jin edilməqdədur qi, by mikdar umymijjətlə Baqь Şyrasь zavodlarьnьn istehsalat kabilijjətlərindən bir az artьkdyr. By zavodlarьn e'mal etdiqləri jymyşak və bərq ƣɵn məta'larь ən çok Baqь bazarlarьnda satьlmakdadyr. Çunqu Azərbajcan qəntləri, xusysi jaşajьş şərtlərinə ƣɵrə, zavod e'malatь olan ƣɵnləri işlətməjib, ɵzlərinin hazьrladьklarь, jarь işlənmiş ƣɵn ilə qifajətlənirlər. Halby qi, Baqь bazarьnьn ƣɵnə olan ehtijacь bɵjuq oldygyndan, Baqь zavodlarь by ehtijacь tamamilə ɵdəjəməjir, byna ƣɵrə də ƣɵn tresti jerli bazarda cənybi Rysja zavodlarьnьn ƣɵn məta'larьnь satmakdadyr. By rəkabətə bakmajarak Azərbajcan zavodlarьnьn mə'mylatь Baqь bazarlarьnda asanlьkla satьlmakdadyr qi, by, bizim zavodlarьmьzьn daha jaxşь cins və jarь val gryplarь (bynlardan çəqmə pəncəsi kajrьlьr) və by jymyşak ƣɵn məta verimlərilə izah olynyr. Mə'mylatь ycyzlandьrmak və jerli xam maldan çok istifadə etməq uçun, Azərƣɵn zavodlarьnьn təchizatlarьnьn kismən dəjişdirilməsi lazьmdyr qi, by iş uçun Azərbajcan ƣɵn tresti 1927-28-ci ildə 20 min manat təxsis etmişdur. Azərqɵn zavodlarь 1926-cь ilin dekabrьnda Baqь Şyrasь nəzdində bylynan, Baqь qimija ƣɵn muəssəsəsinə qeçmişdur.

### 5. Bijan qequ sənajei.

Bijan qequ sənajei tircə „Bijan“ adlanan səhimdarlar şirqətində mərqəzləşmişdur. By şirqətin fə'alijjəti, bijan qequnu tədaruq etməq və presləməqdən ibarətdur. Bijan qequ aşagьdaqь rajonlarda çьkarьlmakdadyr. Ycar, Ləqi, Qurdəmir, Qəncə, Saljan və gejriləridur. Bijan qequ Ycar və Qəncə zavodlarьnda preslənirdi, indi isə bircə Ycarda preslənir. „Bijan“ şirqətinin hej'əti-idarəsi də Ycardadyr. 1924-25 və 1925-26-cь illərdə 1,7 miljon manat kijmətində 16.583 ton bijan qequ ixrac edilmiş idi, 1926-27-ci ildə isə 6.500 ton ixrac edilmişdi. By qeq Şimali Amerika muttəhid ştatlarьna ixrac edilir. 1924-25-ci təsərrufat illərində Azərbajcan qəntliləri jardьmçь kazanc olarak təxminən 500.000 manat pyl, 1000 ton yn, 2 vagon arşьn malь, 50.000 metro ag və gejriləri almьşlardyr qi, byradan, bijan qequ sənajeinin Azərbajcan xalk təsərrufatь uçun nə kədər əhəmijjətli oldygy ajdьn qerunur.

### 6. Tutun sənajei.

Tutun Azərbajcanda çok mikdarda əqilməjib, cumlətanь 760 hektar jer dytyr və by da başlьca Zakatala kəzasьndadyr. Azərbajcanda tutun mə'mylatь başlьca Baqьda mevcyd olan oldykca bejuq 4 fabriqdə hazьrlanьr qi, bynlardan biri Ali Xalk Təsərrufat Şyrasьnьn Azərbajcan Tutun trestinin ixtijarьnda bylynan və „Kьzьl Oktjabr“ adlanan devlət tutun fabriqi, kalan uçu isə „Pivovarov kardaşlarь“, „ aqь şirqəti“, „Şirinbəjov kardaşlarь“ adlь xusysi fabriqlərdur. Təchizatь və istehsalatьnьn mikdarь e'tibarilə ən qucly fabriq „Kьzьl Oktjabr“ devlət tutun fabriqidur. By fabriq 1924-cu ildə elektriqləşdirilmişdur. Azərbajcan tutun tresti xam malь Acarьstan (Syxym tutunu) almakdadyr. Xusysi fabriqlər japrak tutunu başlьca Lagodex (Qurcustan), Kyban və Syxym rajonlarьndan alьrlar. Azərbajcan tutun trestinin artmagь aşagьdaqь mə'lymatdan ajdьn qerunur. 1922-23-də 166 miljon papiros və 20 ton tutun istehsal edilmisdi, 1926-27-ci ildə isə 660 miljon papiros və 65 ton tutun istehsal edilmişdur. Trestin papiroslarь Azərbajcan bazarlarьnda və ən çok Baqьda satьlьr, kismən də (Turqustana) ixrac edilir. Baqь bazarьnьn tutun və papiros ehtijacь o kədər bejuqdur qi, by ehtijacь Azərbajcan tutun tresti edəjə bilmir. Bir hissə papiros Rysja Sosjalist Koşma Şyra Cumhyrijjətindən və Ykrajna Sosjalist Şyra Cumhyrijjətındən: Leningrad tutun trestindən, Krьm tutun trestindən və Don devlət tutun trestindən qətirdilir.

### 7. Poligraf sənajei.

Ən bejuq poligraf muəssəsələri, Baqьda bylynan və Ali Xalk Təsərrufat Şyrasьnьn poligraf tresti tərəfindən birləşdirilmiş №1 və №2 devlət mətbəələri və devlət fotoçinko litografijasь, bir neçə Baqь gəzetələrinin idarələrində bylynan „III Internasjonal“ mətbəəsi və çapçьlar artelinə ajid olan „Əməqçilər şirqəti“ mətbəəsidur. Bir neçə mətbəə, litografija, və magaza Azpoligraftrestin idarəsindən alьnarak (Baqь Şyrasь nəzdindəqi) Baqpoligrafa virilmişdur. Maşьn mikdarь e'tıbarilə poligraftrestin təchizatь tamamilə qafidur, ancak by maşьnlar qehnəlmiş olyb, bynlar təzə konstryksijalь maşьnlar ilə əvəz edilməlidur. Bir para maşьnlar hali hazьrda təzələnmişdur.

Qələmənin adi mə'nasilə, əmtəə satmak məsələsi, poligraf sənajei uçun bejuq bir rol ojnamaz. Çunqu bynlar deməq olar qi, ancak devlət organlarьnьn, koperativ və ictimai muəssəsələrin sьfarьşlarь uzərinə çalьşьrlar, jalьnьz az mikdarda (dəftərxana qitablarь, bloknotlar, dəftərlər və gejri) bazar uçun işləjirlər. Ona qerə də poligraf sənajeinin satьşь deməq by şərajitdə, onlarьn hazьrladьklarь mə'mylat deməqdur.

### 8. Şişə sənajei.

Azərbajcanda şişə mə'mylatь istehsalatь „Azərşişə“ muəssəsəsi tərəfindən birləşdirilmiş, Baqьda bylynan № 1 və № 2 devlət şişə zavodlarьnda mərqəzləşmişdur. By zavodlar 1919-cy ildə tə'sis olynmyşdyr, laqin onlar indijə kədər jalьnьz bytьlkalar və apteq kablarь hazьrlamьşlar və hazьrladьklarь mə'mylat jalьnьz tund jaşьl şişədən olmyşdyr. Jerli şişə sənajeinin by vəzijjətdə bylynmasьnьn səbəbi başlьca by zavodlarьn təchizatьnьn ibtidai halda olmasь və daha jaxşь şişə hazьrlamak uçun lazьmi material olmamasьdyr.

### 9. Baqь Şyrasьnьn jerli sənajei.

Azərbajcan şəhərləri içində nisbətən jerli iri sənajei olan Baqь şəhəridur qi, by sənaje də Baqь Şyrasьnьn idarəsindədur. Jerli sənajei birləşdirməq və juqsəltməq uçun 1926-cь ilin ijyn ajьnda Baqь Jerli Sənaje Şe'bəsi təşqil olynmyşdyr. By şe'bənin hej'ətinə, texniq istehsal və iktisadi əhəmijjətləri e'tibarь ilə təşqil olynmyş mustəkil təsərrufatlar, trestlər daxьl olyr.

By mustəkil təsərrufatlar aşagьdaqьlardyr:

1) Baqь inşaatь(Бакстрой)qi, bynyn hej'ətinə: inşaat daşlarьnь sьndьrmak uçun karjerlər, mebel və xarrat ystaxanasь, qirəç zavody, qərpiç zavody və boçka zavody daxьldyr.

2) Baqь qimija qen (Бакхимкожа) muəssəsəsi qi, bynyn hej'ətinə sabyn zavody və 3 qen zavody daxьldyr.

3) Baqь poligraf muəssəsəsi qi, bynyn hej'ətinə, mətbəələr, litografijalar və magazalar daxьldyr.

4) Baqь məhrykat (Бактоп) muəssəsəsi qi, bynyn hej'ətinə 43 duqan və 3 əsas ambar daxьldyr.

Sonra Baqь jerli sənajeində, ərzak sənajei istehsal—ticarət birliƣi təşqil olynyr qi, by hej'ətə, tutun, makaron, əriştə, kənnadi fabriqləri; hamam, dəniz hamamь qibi kommynal muəssəsələr tresti daxьldyr.

Byndan başka Baqь Şyrasь pijvə zavody və mineral sylarь zavody ilə byzxana icarəjə vermişdur.

Baqь jerli sənajeinin nə kədər bөjuq bir birləşmə oldygyny anlamak uçun Baqь Şyrasьnьn ƣərəq өzunun və ƣərəq icarə verdiƣi muəssəsələrin devrijjəsinin gejri istehsalata ajid məta satьşь devrijjəsini nəzərə almajarak, 1926-27-ci ildə 7 miljona çatdьgьnь xatьrlatmak bəsdur.

Baqь jerli sənajei bөjuq nəticələr əldə etmiş isə də, laqın jenə indi də texniq və malijjə cihətindən zəif oldygyny kəbyl etməlidur, çunqu bir para muəssəsələrin maşьnlarь qөhnəlmiş, lazьmi kədər təchiz olynmamьş və ibtidai—кystar istehsal usyllarь ilə işləməqdədur. Byna ƣөrə də by muəssəsələri səmərələşdirməq və qəlmənin tam mə'nasilə sənaje halьna salmak uçun bөjuq vəsajit və əməq sərf etməq lazьmdyr.

Perspektiv təsərrufata ƣөrə jakьn beş ildə jerli sənajeə 3,6 miljon manat kojmak təsvəvvur edilməqdədur qi, by məbləg aşagьdaqь syrətlə təksim olynacakdyr:

1) Ƣenişləndirmə və maşьnlaşdьrma işləri uçun mevcyd karjerlərə 275 min manat: qərpiç zavodyna 195 min manat, qirəç zavodyna 120 min manat, mebel və xarrat fabriqinə 290 min manat, sabyn zavodyna 25 min manat, ƣөn zavodyna 60 min manat' litografija və mətbəələrə 355 min manat, tutun fabriqinə 30 min manat, Baqь məhrykat muəssəsəsinə 65 min manat, cumlətanь 1.415 min manatdyr.

2) Aşagьdaqь jeni zavod və fabriqləri kyrmaga: asfalt zavodyna 100 min manat, şişə zavodyna 125 min manat, alebastr-cibs—tөqmə zavodyna 110 min manat rdylyzçylyk zavodyna 230 min manat, silisiym tyrşyly bojalar fabriqinə 80 min manat, ququrt tyrşysy zavodyna 450 min manat, mineral bojalarь fabriqinə 400 min manat, çəqmə fabriqinə 300 min manat, konserv zavodyna 80 min manat, mineral sylarь zavodyna 60 min manat, kənnadi fabriqinə 250 min manat qi, cumlətanь 2.185 min manatdyr.

## 10. Ag qөmur və elektriqləşdirmə.

Azərbajcanьn təbii zənƣinliqləri arasьnda tuqənməz, bir mənbe və ejni zamanda ən ycyz bir enerƶi olan „ag qөmur" jə'ni syjyn hərəƣət etdirici kuvvəti çok muhum bir jer dytyr.

Sy kuvvətindən istifadə etməq uzərnə kyrylmyş elektriqləşdirmə Azərbajcan Xalk təsərrufatьnьn juqsəlməsi uçun ən muhum vasitələrdən biri olmalь və elektriqləşdirmə, deməq olar qi, həm istehsal və e'mal sənajeinin hər bir sahəsində, həm də nəklijjatda həjata qeçirilməlidur.



Elektriqləşdirmə, ən az xərc ilə ən çok kazanc verən, ən juqsəq maşьnlaşdьrma formasьdyr. Hali-hazьrda elektriq muhərriqləri, butun başka muhərriqləri (məsələn: byxar muhərriqlərini) aradan çьkarmaga başlamьşdyr.

Elektriq enerƶisinin by kədər umymi jajьlmasь, başka enerƶilərdən heç birində olmajan aşagьdaqь ustunluqlər ilə izah olynyr:

1) Elektriq enerƶisinin yzak məsafələrə ƣөndərilə bilməsi hali-hazьrqь elektrotexnika, enerƶini, radiys uzərilə 400 qilometroja ƣөndərməƣə muvəffək olmyşdyr.

2) Elektriq enerƶisini əldə etməq uçun çaglajan kuvvətlər („ag qөmur"), hətta xьrda cajlarьn akma kuvvətləri („jaşьl qөmur"), dəniz sylarьnьn kabarьb çəqilməsi („ƣөƣ qөmur") qibi muftə enerƶi mənbe'lərindən istifadə edilə bilməsi.

3) Elektriqin: kuvvət (dinamo-maşьnlar), ьşьk (təşəhhub və kevs lampalarь), istiliq (elektriq ocaklarь, mitbəxləri, utuləri və gejri), qimjəvi (məsələn: galvanoplastika), magnit (məsələn: radijo) qibi muxtəlif şəqildə enerƶilərə çevrilə bilməsidur.

Eleqtriq enerƶisinin yzak məsafələrə ƣөndərilə bilməsinin xusysi əhəmijjəti vardyr. Elektriqin by mustəsna xassəsi sajəsində, cumhyrijjətimizin kabagьna Azərbajcanьn hər tərəfində çok mikdarda bylynan sy zənƣinliƣindən istifadə etməq uçun ƣeniş perspektiv açьlmьşdyr.

Elektriqləşmənin həjata qeçirilməsi, juqsəq bir jerdən duşən sy kuvvətindən ycyz enerƶi mənbəi əldə etməƣə imqan verər və by enerƶi elektriq qeçiriciləri vasitəsilə elektriq enerƶisini işlədən jerlərə ƣөndərilə bilər.

Elektriqləşdirmə barəsindəqi by mulahəzə halь-hazьrda Azərbajcan uçun çok əhəmijjət kazanmakdadyr. Sənajein artmasь və jeni muəssəsələrin işə salьnmasь, mə'dən ocaklarьnda, zavodlarьnda, fabriqalərdə maşьn və dəzƣahlarь hərəqətə ƣətirəcəq enerƶi mənbəi məsələsini ƣet-ƣedə daha qəsƣin syrətdə ortaja kojmakdyr.

Baqьnьn, Azərbajcanьn bir çok rajonlarьna nisbətən jakьn olmasь, baqьda qullu mikdarda neft çьkarьlmasь, Azərbajcan nəklijjat və sənajei uçun nefti ən jaxşь bir enerƶi mənbəi olarak irəli surmuşdu, laqin neft janacagьnьn jandьrьlmasьnьn məksədə ygynlygy, hali-hazьrqi şərtlər içərisində ƣet-ƣedə şubhəli bir məsələ halьna ƣirməqdədur.

Umym ittifakьn mənfəətləri nөktəji nəzərindən neftdən, hər şejdən əvvəl Şyralar Ittifakьnьn jerli janacagь və hidro-enerƶisi

olmajan və ja çatьşmajan rajonlar istifadə etməli və sonra nəklijjat işlərində istifadə olynmalьdyr.

Azərbajcanda istifadə edilməjən sy enerzisi mənbə'ləri (Qur, Aras, Tərtər və bir çok qiçiq çajlar) vardyr. Byna qørə neftin qeniş syrətdə işlədilməsi dogry olmajьb bizim sənajeimiz „ag“ və „jaşьl qømurdən“ ən çok istifadə etməqə çalьşmalьdyr.

Azərbajcanda hidro-elektriq stansijalarь kyrmak işində nə edilmişdur? 1924 27-illər içərisində Azərbajcanьn muxtəlif kəzalarьnda 19 elektriq stansijasь kyrylmyş və təzələndirilmişdur; bynlarьn umymi qucləri 15000 at kuvvətindədur. By stansijalarьn hamьsь jerli əhəmijjətdə olyb çok hissəsi janacak muhərriqlidurlər (jə'ni by stansijalarda elektriq enerzisi əldə etməq neft məhsylatь uzərinə əsaslanmьşdyr). Bynlardan ən iriləri 350 at kuvvətində Qəncə stansijasь, 180 at kuvvətində Şəqi stansijasь, 140 at kuvvətində Saljan stansijasь və hər biri 100 at kuvvətində Naxçьvan və Karjaqin stansijalarьdyr.

Rajon əhəmijjətində olan hidro-stansijalara qəlincə: şəqidə Qiş çajь uzərində 850 at kuvvətində bir hidro-stansija kyrylmyşdyr. Qəncə çajь uzərində 3750 at kuvvətində, Aşagь-Zyrnabad hidro-stansijasьnьn kyrylmasьna başlanmьş və 1929-cy ildə işə salьnacakdyr.

Qəncənin butun sənaje rajonyny elektriqləşdirməq uçun, Qəncə jakьnlьgьnda Kara-Sakkal uzərində 42.800 at kuvvətində quclu bir hidro-stansijanьn kyrylmasь Azərbajcan həqumətі tərəfindən kəbyl edilmiş və byna Şyralar Ittifakь, devlət planь razьlьk vermişdur.

Cumhyrijjətimizin butun sənajeinə (və o cumlədən Baqь neft sənajeinə) syvarma və qənt təsərrufatьna elektriq enerzisi verə biləcəq daha quclu hidro-elektriq stansijasьnьn və ja bir neçə hidrosentrallarьnьn inşa edilməsi məsələsi, əqər by jakьn beş ildə olmazsa, iqinci və ja uçuncu beş ildə Azərbajcanьn kabagьna çьkacagь şubhəsizdur, çunqu Baqь rajonyny, syvarmanь və xusysilə pambykçylykdan øtru qeniş Mil, Mygan və Şirvan çøllərini tə'min etməq məsələsi jakьn zamanьn məsələsidur.

Kət'i syrətdə elektriq enerzisi işlədilməsini tələb edən başka rajonlara qəlincə by rajonlarda hidrostansija inşa etməq məsələsi perspektiv planda, aşagьdaqь tərtib uzrə dyrmakdadyr.

1) Tavys hidro-stansijasь; by stansija Axьnca-Çaj uzərində kyrylacak və 1050 at kuvvətində olacakdyr. Stansija başlьca Tavys çimento zavodyny və jakьnda olan topraklarьn maşьn ilə syvarьlmasьnь elektriq ilə tə'min edəcəqdur.



2) Stepanaqert hidrostansijasь. By stansija Daş-Altь çajь uzərində kyrylacak və 350 at kuvvətində olacakdyr. Stansija Stepanaqert və Şyşada ipəq zavodlarьnь, ystaxanalarь, mətbəələri və dəjirmənləri elektriq ilə tə'min edəcəqdur. By stansijanьn kyrylmasьna başlanmьşdyr.

3) Zakatala hidrostansijasь. By stansija Tala-Çaj uzərində kyrylacak və 400 at kuvvətində olacakdyr. Stansija taxta zavodyny, butun fabriqini və rajonyn kystar muəssəsələrini elektriq enerzisi ilə tə'min edəcəqdur. By stansija kyrylmaga başlanmьşdyr.

4) Lənqəran, Astara stansijasь. By stansija Tanqərə Çaj uzərində kyrylacak və 300 at kuvvətində olacakdyr. By stansija Lənqəran-Astara şəhərlərini ьşьklandьracak, taxta mişarlama zavodyna, sun'i syvarmaja və dəjirmənə elektriq enərzisi verəcəqdur.

5) Ordybad-Cylfa hidrostansijasь. By stansija Volans çajь uzərində kyrylacak və 200 at kuvvətində olacakdyr. Stansija şəhərin elektriq ehtijacьnь və sun'i syvarmanь tə'min edəcəqdur.

6) Kyba hidrostansijasь. By stansija Kydjal çajь uzərində kyrylacak və 200 at kuvvətində olacakdyr. Stansija şəhərin elektiriq ehtijacьnь, çaxьr, və konserv zavodlarьnь və ystaxanalarь tə'min edəcəqur.

## III. KYSTAR SƏNAJEI

### 1. Dar mə'nada kystar sənajei nədur?

Dar mə'nada kystar sənaje, fabriq-zavod sənajeindən, və ev sənətindən fərkli olarak əl ilə işlənilən sənaje formasьna dejilir. Ancak byradan zavod-fabriq ev sənəti və kystar sənaje formalarь arasьnda muəjjən və tamamilə ajrьca bir hydyd oldygy anlaşьlmamalьdyr. Sənaje və onyn formalarьnьn tarixi inqişaf prosesində, kystarlarьn øz mə'mylatlarьnь javaş-javaş xusysi ystaxanalara qeçurmələri, sənətqarlarьn isə øz ystaxanalarьnda qet-qedə mexaniq muhərriqlər işlətmələri qibi aralьk, qeçid formalar muşahədə olynyr.

Bynynla barabar, by cur qeçid formalarь xaricində, kystar sənajei bir tərəfdən maşьn tətbik edilməməsilə, o biri tərəfdən xusysi ystaxanalar vasitəsilə ajьrd edilir. Adəta, hali-hazьrda sənətqarlar da kystarlar sьrasьna daxil edilir və by syrətlə qəlmənin tam mə'nasь ilə kystar sənajei əldə edilmiş olyr.

Çok zaman kystar ejni zamanda əqinçi qəntlidur, by halda kystar istehsalatьna qənt təsərrufatьnьn bir jardьmçь istehsalatь olarak bakьlmalьdyr. By kystar sənajeində ən çok hallarda jalьnьz muəjjən rajonda və hətta muəjjən qəntdə əl altьnda bylynan: jyn, qøn; lifli bitqi, agaç, qil və gejri qibi xam mallar işlənilir.

Azərbajcanьn kystar sənajei iqi istikamətə ajrьlьr: birincisi jerli qənt camaatьnьn ehtijacьnь ødəməq uçun: kab-kacak, mebel, paltar, çəqmə və gejri qibi cur-bə-cur ev majehtacь, iqincisi—komfort (rahətliq) və bədii ehtijacь tə'min uçun olan: xalça, ipəq tokymalar, agaçdan kajьrma cur-bə-cur mə'mylat qibi şejlərdur.

## 2. Kystar sənajeinin əhəmijjəti

Azərbajcanьn (Azərneft, Lenin adьna fabriq və gejrilərindən başka) dövlət sənajeinin ciddi syrətdə inqişafь uçun, daha bir çok ƣərƣin təsərrufat illəri ƣərəqdur. Halby qi, bazarda, bir tərəfdən bir para mətaʼlarьn joklygy hiss edilməqdədur və o biri tərəfdən bir para istehsalat arasьnda işsizliq ƣørulməqdədur.

Byna ƣørə də aşagьdaqь iqi moment, hali-hazьrqi təsərrufat vəzijjəti içərisində kystar istehsalatьnьn inqişafьnь tələb edir:

1) Kystar məhsylatьnьn artmasь, bizim iri sənajeimiz tərəfindən e'mal olynan və daha bir neçə illər içərisində istehlaq bazarьnьn tələbini tə'min edə bilməjəcəq olan əsas sənaje mətaʼlarьmьzьn tamamlajьcьsь olmalьdyr;

2) Kystar istehsalatьnьn ƣenişlənməsi artьk işçi kuvvəsini øzunə cəlb edərəq işsizliƣin azalmasьna qøməq edəcəqdur.

Umymijjətlə kystar istehsalatьnьn və xusysən kystar sənətqar kooperasijasьnьn inqişafьna qøməq etməq lazьm oldygy, 1927-ci ilin 3 majьnda Şyralar Ittifakьnьn Xalk Komisarlar Şyrasь tərəfindən xusysi kərarnama ilə təsbit edilmişdi.

Kystar sənajei Azərbajcan həjatьnda hər jerdə ejni iktisadi əhəmijjətdə dejildur. Jaj zamanьn kьsa və işçilərin əqinçiliqlə məşgyl olmasь tam həcimdə olmajan daglьk rajonlarda əqinçiliƣə jardьmçь olan kystar sənajein inqişafь ƣuclənməqdədur. Jaj zamanь yzyn olmakla barabar topraklarь az və ja gejri-munbit olan rajonlar da ejni haldadyr. Tərsinə başlьca cur-bə-cur sənaje və texniq bitƣilərin jetişdirilməsi qibi, qənt təsərrufatь uçun musaid şərtlər olan jerlərdə, kystar sənaje uçun sərbəst işçi kuvvəsi çok az kalar.

## 3. Kystarlarьn umymi mikdarь və onlarьn ixtisaslara ƣørə bølunməsi

Hərbdən əvvəl Azərbajcanda muxtəlif ixtisaslarda çalьşan 60.000 kystar var idi. 1926-ci ildə dytylan sijahijə ƣørə Azərbajcanьn xьrda kystar sənətqar sənajeində məşgyl olan şəxslərin ədədi (bə'zi təshihat ilə) 55335 oldygy ƣørulmuşdur qi, bynlardan 35724-i qəntlərdə, 19611-i şəhərlərdə çalьşmakdadyr.



**55335 KYSTAR-SƏNƏTQAR, SƏNƏTLƏRINƏ ƢØRƏ BY CUR BØLUNUR:**

| Sahələr gyrypy və karakteriq istehsalat | Mikdar | Mulahəzat |
|---|---|---|
| Hamьsь: Şəhərlər | 19611 | |
| Hamьsь: Qənt jerləri, | 35724 | |
| Hamьsь: Jəqyn | 55335 | |
| 1. Jyn işləməsi: şəhərlər | 680 | |
| Qənt jerləri | 18755 | Jyn əjirmə, jyn tokyma, incə qeçə və xalçaçьlьk (şəhərdə 225, qənt jerlərində 15000). |
| 2. Jejinti sənajei: şəhərlər | 1996 | |
| Qənt jerləri | 4603 | Yn ujutmə, jarma, çaxьrçьlьk, çərəqçiliq. |
| 3. Paltar və tyalet: şəhərlər | 7911 | Tiqişçiliq sənajei, trikotaƶ istehsalatь, ƣøn və çəqmə istehsalatь. |
| Qənt jerləri | 3538 | |
| 4. Metal işləməsi və maşьn inşaatь şəhərlər | 2857 | |
| Qənt jerləri | 2592 | |
| 5. Ipəq işləməsi şəhərlər | 2376 | |
| Qənt jerləri | 1968 | |
| 6. Agaç işləməsi şəhərlər | 1131 | |
| Qənt jerləri | 2988 | Taxtaçьlьk, ʙoçkaçьlьk, xarratlьk, meʙelçiliq, çarxçьlьk istehsalatь. |
| 7. Ƣøn-dəri sənajei şəhərlər: | 1023 | |
| Qənt jerləri | 203 | |
| 8. Mineral istehsal və işləməsi-şəhərlər | 360 | |
| Qənt jerləri | 350 | Qərpiçliq, dylyzçylyk istehsalatь. |
| 9. Balьkçklьk, şəhərlər | 238 | |
| Qənt jerləri | 490 | |
| 10. Mə'dən və mə'dən zavod sənajei: şəhərlər | 163 | |
| 10. Mə'dən və mə'dən zavod sənajei: Qənt jerləri | 6 | |
| 11. Qimija sənajei şəhərlər | 81 | Başlьca saʙynçylyk. |
| Qənt jerləri | 11 | |
| 12. Hejvanat materijallarьnьn işlənməsi: şəhərlər | 27 | |
| 12. Hejvanat materijallarьnьn işlənməsi: Qənt jərləri | 5 | |
| 13. Pamʙyk işləməsi-şəhərlər | 22 | |
| Qənt jerləri | 108 | |
| 14. Qagьz sənajei-şəhərlər | 37 | |
| Qənt jerləri | — | |
| 15. Poligraf sənajei-şəhərlər | 220 | |
| Qənt jerləri | 6 | |
| 16. Elmi-nəfis sənaje: şəhərlər | 466 | |
| 16. Elmi-nəfis sənaje: Qənt jerləri | 72 | |
| 17. Lifli maddələr işləməsi: şəhərlər | 23 | |
| 17. Lifli maddələr işləməsi: Qənt jerləri | 23 | |

By cədvəldən anlaşılır qi, Azərbajcanın xırda kystar və sənətqar sənaje'lərində işləjən butun işçi qutləsindən şəhərdə olanlar, qəntdə olanlardan təxminən iqi dəfə daha azdyr. By isə qəntdə, çok jajılmış olan bynyn işlənməsi ilə izah olynyr. Ən muhum sənət: jyn mə'mylatın işlənməsi (xalçaçılık), metal, ipəq, agaç, jejinti işlənməsi, paltar, tyalet və iləx...istehsalatıdyr.

## 4. Kystar-sənətqar kooperasijası. Azsənətbirliqi

Hequmət kystar istehsalatının inqişafını lazım bilməqinə qerə, kystar sənətqar kooperasijasının inqişafı çok əhəmijjət kazanmakdadyr. Təşqilatlarımızın sıfarışlarını jərinə jetirməq uçun təsərrufatımızın ictimai sektorları ilə birliqdə çalışan kystar sənətqar kooperasijası, onlara satış və kredit barəsində qeməq edilməq şərtilə, həm devlət tərəfindən aparılan təsərrufat sijasətinə və həm əsas qutlənin istehlaq ehtijacına yjgyn olarak inqişaf edər. Kystarların təşqilat rəhbərliqi olmadan təbii olarak kooperativləşməqə çalışması bir para nəticələr vermişdur: 1926-cı ildə Azərbajcanda 90-dan artık kystar sənətqar şirqətləri—artelləri var idi. By artellərin 4000 nefərdən artık uzvləri var idi. By təbii prosesi muəjjən bir məcraja salmak lazım idi. Belə bir mərqəz 1927-ci ildə Azərbajcan sənətqarlar kooperasijası birliqi (Azsənətbirliqi) adı altında təşqil olyndy. By birliqin başlıca vəzifələri bynlardyr:

1) Təşqilat sahəsində birləşmiş ajrı-ajrı kystarları təftiş etməq və onları artel və şirqətlərdə birləşdirməq.

2) Təchizat və satış sahəsində kooperativləşmiş kystarları xam mal, jarım fabrikat və by kystarların işlətdiqləri məhsylat ilə tə'min etməq uçun devlət organları və kooperasija ilə rabitə duzəltməq.

3) Istehsalat sahəsində—işlədilməjən devlət zavodlarının sənətqar kooperativlərinə verməq, və həmçinin, maşınlaşdırma və elektiriqləşdirmə vasitəsilə kystar istehsalatını səmərələşdirməqə çalışmak.

4) Malijjə cihətindən tə'min etməq sahəsində kystar sənətqar kooperasijalarını malijjə cihətdən məhqəmləndirməq.

Azsənətbirliqi təşqil olyndygy zaman 43 kystar kooperativ şirqət və artellərini birləşdirmişdi. 1927-ci ilin 1 avgystynda isə Azsənətbirliqinin hej'ətinə 93 aşagı təşqilat daxıl olmyşdy, bynların umymi uzvləri mikdarı 2480 nəfər idi qi, by mikdar kooperativləşmiş kysatarların 49%-ni təşqil edir.



## 5. Xalçaçılık

Xalçaçılık deməq olar qi, butun Azərbajcana və xusysilə bejuq kojynçylyk rajonlarına jajılmış olyb, by sənətə jardımçı bir məşgylijjət qibi bakın qənd təsərrufatı qəlirində bejuq əhəmijjəti vardyr. Xalçanı turq kadınları ən çok kış ajlarında, qənt təsərrufat işlərindən azad oldykları zamanlarda tokyjyrlar. Xalça tokyjycylar ez məşgylijjətlərinə ilavə bir məşgylijjət qibi bakırlar. Xalçaçılık qənt təsərrufatından çok az qəliri olan joksyllar uçun əhəmijjətlidur. Hərbdən əvvəl Azərbajcan xalçaları, ez qejfijjətləri, nəkşlərinin qezəlliqi e'tibarilə Iran və Turqustan xalçalarından qeri kalmırdı. Byna qerə də dunja bazarında Azərbajcan xalçasına olan tələb çok bejuq idi.

Xalçanın oldykca bejuq ixracat əhəmijjəti vardyr. 1926-27-ci ildə ixracat uçunı Azərbajcanda 1100 min manatlıkdan artık xalça tokynmyşdy.

Qərəq sənaje və qərəq texnika və nəfisliq e'tibarı ilə çok əhəmijjəti olanı xovly xalçadyr. By cur xalılar adəta 4 metro yzynlykda və 1,5 metro eniliqdə tokynyr. Xovları sık və kısa olyr. Xalçaların nəkşləri ən çok həndəsi ornamentlər olyr. Laqin insan və hejvan şəqillərinə də təsaduf olynyr. Qul və gejri çiçəq dəstəsi şəqilləri də vardyr, jaxşı cins xalılar çok mehqəm olyr. Qehnə usyl ilə bitqi bojaları ilə bojadıkda xalçaların rənqləri solmadıgı qibi, zaman qeçdiqcə daha da jymyşalır və daha da jaxşılaşır. Axırıncı ijirmi il içərisində ycyz anilin bojaları işlədilməqə başlanmışdyr. By bojalar tez solyr və by səbəblə də xalça kijmətdən duşur, byna qerə də anilin bojalarını alizarin bojaları ilə əvəz etməqə və ja qehnə usyl ilə bitqi bojalarını işlətməqə başlamışlardyr.

Diqər tip xalçalar, çok junqul və incə olan cecimlərdur. Cecim iqi uzlu xalça tokymasıdyr. Cecimin nəkşləri aralıklı və yzynlamasına qedən, rənqli zolaklardyr. Cecimlər bəzəq vəzifəsini qerur.

Palas da çok jajılmış olyb xusysilə Saljan kəzasında tokynyr. Palas iqi uzlu, yzynlamasına, rənqli zolakları olan hamar bir tokymadyr. Xalça tokymalardan ən adisi palas olyb çok zaman darak-agzı jyndan tokynyr. Qilim palasdan nəkşlərilə ajrılır. Xalı mə'mylatının karakteriq cinsi, Kyba kəzasında tokynan symaxdyr. Symax bir uzlu, xovsyz bir tokyma olyb tokymasının murəqqəbliqi və nəkşlərindəqi sənətqarlık e'tibarı ilə qilim, palas və cecimdən ustundur. Symax tokymak uçun vərdiş və jaxşı zevk lazımdyr. Bynlardan başka çyval, xyrcyn, mafraş kajrılır.

Azərbajcan Ali Xalk Təsərrufat Şyrasь Kystar şə'bəsinin təftişatьna ƣɵrə xalça tokyjanlarьn mikdarь və onlarьn (xalça, palas və gejri qibi) mə'mylatlarь aşagьdaqь cədvəldə ƣɵstərilmişdur.

| Illər | Xalça tokyjanlarьn ədədi | Xalça tokyma mə'mylatь |
|---|---|---|
| 1913 | 39139 | 108774 |
| 1924–25 | 13399 | 16119 |

Вy syrətlə, 1924-25 ci ildə xalça istehsalatь hərbdən əvvəlqinə nisbətlə çok azalmьşdyr. Təbii olarak bir syal çьkьr; by kədər kijmətli olan xalçaçьlьk nədən ɵtru by kədər sur'ətlə duşmuşdur? Səbəbləri bydyr:

1) Butun Azərbajcan daxilində fevkəl'adə dagьdьcь kuvvətlə tə'sir edən və joksyllyga, bir çok jerlərdə isə tamamilə qəntlilərin iflasьna səbəb olan erməni-turq kьrgьnь.

2) Hərbdən əvvəlqinə nisbətlə jynyn fevkəl'adə bahalaşmasь.

3) Xarici anilin bojasьnьn həddən artьk bahalaşmasь və ja busbutun olmamasь.

4) Xalçaja olan tələbin oldykca azalmasь və materialьn baha olmagьna ƣɵrə xalçanьn otyryş kijmətinin bahalaşmasь.

Hali-hazьrda xalçaçьlьgьn jykarьda səjlənilən agьr vəzijjətinə bakmajarak jə'ni: kreditin, deməq olar qi, olmamasьna və satьşьn kajdaja salьnmamьş oldygyna bakmajarak, uç xalçaçьlьk rajonynda aparьlan təftişə ƣɵrə xalçaçьlьgьn jenə də bərpa olmaga başladьgь anlaşьlmьşdyr qi, by, aşagьdaqь rəkəmlərdən də ƣɵrunur:

| Rajonlar | 1924—25 | | 1926—27 | |
|---|---|---|---|---|
| | Xalçaçьlarьn ədədi | Xalçalarьn ədədi | Xalçaçьlarьn ədədi | Xalçalarьn ədədi |
| Şamaxь . . . . . . . . . . . | 1350 | 939 | 3126 | 6254 |
| Kyba . . . . . . . . . . . | 2703 | 4415 | 4414 | 7110 |
| Myxtarijjətli Karabag . . . . . | 35 | 70 | 196 | 283 |
| Jəqyn . . . | 4088 | 5424 | 7736 | 1364 |

Xalça hali-hazьrda, xusysi binəqdarlar vasitəsilə, Azsənətbirliƣi tərəfindən tədaruq edilməqdədur. Tədaruq kijmətinin azlьgь və byna ilavə binəqdarlarьn da aldьklarь kazanc jerlərdə xalçanь tamamilə kijmətdən salьr, by hal isə xalçaçьlьgьn inqişafьna ənƣəl tərədir. Byna ƣɵrə də Azsənətbirliƣi, qəntlilərin xalçanь dogrydan-dogryja kystar kooperasijalarьna sata bilməsi işini jolyna kojmalьdyr.



Binəqdarlar xalçanь adəta by cur tədaruq edirlər: binəqdar lazьmi mikdarda manyfaktyr tədaruq edib qəndə ƣedir və orada manyfaktyranь xalça ilə mubadələ edir.

Dəzƣahlara ƣəlincə, xalça tokyjan arvatlar ən ibtidai və əldə kajьrma dəzƣahlarda işlədirlər. By dəzƣahlar „xana“ adlanьb kijmətləri də ən çoky 50 manatdyr. By dəzƣahlar qəntlərdə evdə qəntli sənətqarlar tərəfindən kajьrьlьr.

## 6. Misƣərliq

Misƣərliq adь altьnda, misdən kazan, tas, qupə qibi kablar kajьrma sənəti anlaşьlьr.

Xalçaçьlьga Azərbajcan kəza və qəntlərində jardьmçь bir sənət qibi bakьlmak lazьm ƣəlirsə də, misƣərliq Şamaxь kəzasьnьn Lahьç qəndində ƣeniş istehsalat karakterindədur və (1000 həjətli və 7000 nufysly) by bejuq qəntdə qəntlilərin əsas sənətini təşqil etməqdədur. Lahьç qəndində əqinçiliƣə jarar toprak olmadьgьndan by qəndin camaatь xatьrlanmajan çok qəhnə zamandan bəri misdən mətbəx kablarь hazьrlamak sənətilə və byndan başka Qurdəmir stansijasьna hazьr mis kablarь aparьb kajьdanda qəndə xam mal daşьmak ilə məşgyl olmyşlardyr.

Təbiət lahьclьlarь həjat mubarizəsində bir tərəfdən incitmiş, jə'ni toprakdan istifadə imqanьndan məhrym etmiş isə də, o biri tərəfdən mineral zənƣinliƣilə muqafatlandьrmьşdyr. Qəndi ihatə etmiş olan daglarda mis, ƣumuş və gejri vardyr. Lahьç camaatьnьn misƣərliq ilə məşgyl olmasь da, by daglarda mis ehtijatьnьn bylynmasь ilə izah olynyr. Laqin ƣet-ƣedə ust katlardaqь mis ehtijatь kyrtarmьş və aşagь katlardaqь misdən istifadə etməq jerli camaatьn ƣucu xaricində olmakla lahьclьlar ɵz istehsalatlarьna lazьm olan misi qənardan (Tiflisdən, Daglьk Karabagdan) ƣətirtməƣə başlamьşlardyr.

Hərbdən əvvəl Lahьc mə'mylatь butun Kafkaza hətta Iran və Turqijəjə ixrac edilirdi. Hali-hazьrda misƣərlərin vəzijjətləri çok agьrdyr. Bynyn səbəbi lazьmi kədər misin olmamasь və Lahьcda jenidən təşqil edilən iqi misƣərlər şirqətinin işinin jolyna ƣirməməsidur. Byndan başka misƣər kystarlar by saat ajrь-ajrь çalьşmakdadyrlar, byna ƣɵrə də bynlar ajrь-ajrь binəqdarlar tərəfindən asanlьkla iflas etdirilə bilirlər. Misƣərlərin ədədi 1914 - 1917-ci ildə 600 iqən indi 200 - 250 nəfər kədərdur. Kooperativləşmiş misƣərlərin umymi mikdarь 40 nəfər kədərdur.

## 7. Ipəqçiliq

Kystar ipəqçiliq məhsylatь Azərbajcanьn ipəq tokycylarьnьn ehtijacьnь tə'min etdiƣi qibi Azərbajcandan xaricə də ƣɵndərilməqdədur. Kystar ipəqçi q Şəqi kəzasьnda mərqəzləşmişdur. Hərbdən

əvvəl ipəqçiliq ilə 380 ysta kystar məşgyl idi. Bynlarьn 380 dəzƣahlarь olyb ildə 570 min manat kijmətində təxminən 45.600 qilogram xam ipəq və 114 min manat kijmətində 22800 qilogram aşagь cins ipliq hazьrlar idilər. Istehsalatlar 182400 qilogram barama işlədirdilər. 1924 - 25-ci ildə 462 kystar çalьşdь. Bynlar 762300 manat kijmətində 16176 qilogram xam ipəq və 69300 manat kijmətində 14188 qilogram aşagь cins ipliq hazьrladьlar və byndan өtru 88704 qilogram kyry barama işlətdilər.

### 8. Ipəq tokymaçьlьk

Ipəq tokyma mə'mylatьna olan tələb Zakafkasja və Şyralar Ittifakьnьn başka jerlərində ƣundən ƣunə artmakda oldygyndan, Azərbajcanda ipəq tokymaçьlьgь bөjuq əhəmijjət kazanmakdadyr. By tələbin artmasьna səbəb Şyralar Ittifakьnьn iri sənajei, qalagajь, çadra və gejri qibi şərklilərə məxsys ipəq mə'mylat hazьrlamajьr, başka tərəfdən iri sənajein ipəq mə'mylatь bizim cumhyrijjətimizin qənt qutləsinin muəjjən zevkini өdəməjir.

Xam ipəƣin bahalaşmasь, onyn az mikdarda satьşa çьkarьlmasь, xaricdən ƣələn qimjəvi bojanьn çok baha olmasь nəticəsində kystar ipəqçiliq bөjuq bөhran qeçirməqdədur.

Azərbajcanda ipəq tokymaçьlьk iqi mərqəzdə toplanmьşdyr. Şamaxь kəzasьnьn Baskal qəndində və Ƣəncədə. Baskalda məmylatьn ancak çok az hissəsi (bir rənƣli qalagajьlar) bojanьr. Çok hissəsi isə bojanmakdan өtru Baqь və ja Ƣəncəjə ƣөndərilirdi. Hali-hazьrda başkallьlar xam ipəƣi Şəƣidən alьrlar və hazьrladьklarь mə'mylatь Ƣəncədə bojajьrlar.

Ƣəncədə şərk ipəq mə'mylatь nisbətən jaxşь bir vəzijjətdədur. Bojaxanalarьn ədədi 60-a kədərdur: Azərbajcanda ipəq tokymaçьlьgьnьn çok canlь olmasь Azərbajcanьn daxili bazarьnda şərk zevkinə yjgyn ipəq mə'mylata olan tələbin artьklьgь ilə izah olynyr. Baskalda isə ipəq tokymaçьlьk sənətinin duşməqdə oldygy ƣөrulməqdədur qi bynyn da səbəbi, Baskalьn dəmir jol xəttindən yzak olmasь, jerli xam ipəƣin və bojaxananьn olmamasьdyr.

Ipəqçiliƣin iktisadi əhəmijjəti barəsində bir fiqir verməq uçun aşagьdaqь rəkəmləri ƣөstərəq.

Hərbdən əvvəl butun Azərbajcanda 1600 ipəq tokyma dəzƣahь işləjir və ildə 67200 qilogram xam ipəq işlədərəq 1380 min ƣalagajь hazьrlajьrmьş 1924-25 ci ildə 1400 ipəq tokyma dezƣahь işləmiş və 76864 qilogram xam ipəq işlədərəq 928 min qalagajь hazьrlamьşdyr.

### 9. Sənətqaranə kystar işləri və dylyzçylyk

Zakafkasja çokdan bəri, ƣumuş və az mikdarda kьzьlь sənətqaranə işləjən kystarlarь ilə məşhyrdyr. Ƣumuşdən, minadən, kьzьldan, fil sumuqundən, xəncər qəmər, tapanca, tufənq və jəhər takьmь hazьrlanmasь bir vaktlar muqəmməlijjətin ən son dərəcəsinə çatmьşdь. Silahçьlьk sənəti duşduqdən sonra zərƣərlər ev majehtacь hazьrlamaga başlamьşlardyr. Istehsalat mərqəzi Baqьdyr.

Azərbajcanda kystar dylyz istehsalatь oldykca jajьlmьşdyr. By istehsalatda ev kab-kacagь, çaxьr saklamak uçun jeqə qupələr, qərpiç, qirəmid hazьrlanьrdь və hazьrlanmakdadyr. Azərbajcanda dylyz istehsalatьnьn ən muhum mərqəzləri Kyba kəzasьnьn Isbiq və Mөhuc qəntləri, Şamaxь kəzasьnьn Sьgnan, Ƣurcuvan və Qejvandi qəntləridur.



---

### B. KONTROL IŞLƏRI UÇUN MOZY'LAR

Iş materialь uzərinə aşagьdaqь məslələri fiqirləşin və təhlil edin:

1) Azərbajcanda mə'dən zavod senajeinin inqişafь ucun mə'lymat varmьdyr, jazьn?

2) Daşqəsən dəmir mə'dəni jatagьnьn, Azərbajcanьn ƣələcəq iktisadi inqişafь uçun nə əhəmijjəti vardyr?

3) Өz qənt, dajirə, və ja kəzanьzda hansь kystar istehsalat jajьlmьşdyr? Təsvir edin.

### C. KONTROL SYALLARЬ

Aşagьdaqь syallara jazь ilə cavab verin:

1) Azərbajcan hansь kazьntьlar ilə zənƣindur?

2) Azərbajcanda bylynan me'dən zavod işlərinin hamь nev'lərini karakterizə edin.

3) Azərbajcanьn ən muhum işləmə senajeinin muhum sahələrini təsvir edin.

4) „Ag qөmur“ nədur, və bynyn Azərbajcanьn elektiriqləşdirilməsi uçun nə əhəmijjeti vardyr?

5) Qəlmənin dar və ƣeniş mə'nasilə, kystar sənajei nədur?

6) Kystar sənajenin Azərbajcan iktisadijjatьndaqь roly nədur?

7) Azsənətbirliƣi nədən өtru teşqil olynmyşdyr?

8) Azərbajcandaqь kystar sənajeinin ən muhum nevlərini sajьn.

9) Azərbajcandaqь xalça tokymaçьlьgьnь, ipeqçiliƣi və ipəq tokymaçьlьgь təsvir edin.

### 4. Baqь şəhərində və Azərbajcan kəzalarьnda ictimailəşdirilmiş və xusysi ticarət əmtiə tədavulunun mukajəsəsi.

CƏDVƏL 3.

| Ticarət sektory | 1925-26 il | | | 1927-28 il | | |
|---|---|---|---|---|---|---|
| | Cumlətanь Min manatlar ilə | Bynlardan: Baqь Min manatlar ilə | Bynlardan: Kəza Min manatlar ilə | Cumlətanь Min manatlar ilə | Bynlardan: Baqь Min manatlar ilə | Bynlardan: Kəza Min manatlar ilə |
| Devləti . . . | 134067,7 | 118837,5 | 15230,2 | 167397,0 | 158334,6 | 13562,3 |
| Kooperativ . . . | 88432,9 | 59222,1 | 29210,3 | 207972,9 | 131100,0 | 76900,0 |
| Xvьysi. . . . | 144600,0 | 105800,0 | 38800,0 | 137100,0 | 85000, | 52072,0 |
| Umymi tədavul | 367100,6 | 283859,6 | 83341,0 | 512469,9 | 369934,6 | 142535,3 |

By cədvəldən qərulur qi: 1) Azərbajcanьn umymi əmtiə tədavulundə Baqьnьn xusysi çəqisi kəzalardan daha juqsəqdur, 2) xusysi kapital, tədavulunun muhum hissəsini kəzaja qeçur və bynyn mikdarь artьr, 3) xusysi əmtiə tədavulunun roly Baqьda və kəzalarda əhmijjətsiz mikdarda olyb, qet-qedə azalьr.

### 5. Ticarət mevke'lərinin dinamikasь.

Butun sektorlarda ticarət şəbəqəsinin nə syrətlə inqişaf etdiqini ajdьnlaşdьrmak maraklьdyr. By məsələ barəsində aşagьdaqь cədvəldən lazьmi mə'lymat alьna bilər.

| Hak-hesab devri | Devlət sektory: Mutlək ədədlər | Devlət sektory: Prosent hesabilə: Xusysi çəqi | Devlət sektory: Prosent hesabilə: 24-25 il tarixində | Kooperativi sektory: Mutlək ədədlər | Kooperativi sektory: Prosent hesabilə: Xusysi çəqi | Kooperativi sektory: Prosent hesabilə: 21-25 il tarixində | Xusysi ticarət sektory: Mutlək ədədlər | Xusysi ticarət sektory: Prosent hesapilə: Xusysi çəqi | Xusysi ticarət sektory: Prosent hesapilə: 24-25 il tarixində |
|---|---|---|---|---|---|---|---|---|---|
| 1924-25 il | 266 | 2,1 | 100 | 629 | 5,0 | 100 | 11633 | 92,9 | 100 |
| 1925-26 il | 445 | 3,3 | 167,3 | 992 | 7,3 | 157,7 | 12233 | 89,4 | 105,1 |
| 1926-27 il | 498 | 3,1 | 187,2 | 1230 | 7,8 | 195,5 | 14095 | 89,1 | 121,2 |

Azərbajcanda ticarət muəssəsələri şəbəqəsi 1924—25-də 12528 mevkeindən ibarət idi (11633+629+266), bynlardan 11633-i və ja 92,9 %-i xusysi ticarətə, 865-i və ja 7,1 % ictimailəşdirilmiş sektora ajid idi. By şəbəqə 1926—27-ci 15823 mevkeə kədər artdь, bynlardan 14095 ədədi və ja 89,1 %-i xusysi ticarətə 1728 ədədi və ja 10,9 % ictimailəşdirilmiş sektora ajid idi.



By syrətlə xusysi sektoryn şəbəqəsi nisbi olarak bir kədər (29,9 %-dən 89,1 % kədər) azaldь, mutlək olarak isə 1924—25-ci ilə qərə 21,2 % artdь:

Birinci bakьşda, Azərbajcan ticarət şəbəqəsi barəsində qəstərdiqimiz rəkəmlər, əvvəlcə xusysi ticarət hakkьnda çьkardьgьmьz nəticələrə zidd qibi qərunur, çunqu xusysi ticarətdə ticarət mevke'lərinin mutlək artmasь, devlət ticarəti və kooperasijanьn mevke'lərinə qərə, onlarьn mikdarlarьnьn çoklygy, umymi ticarət sistemində xusysi sektoryn quclənməqini qəstərir. Laqin xusysi ticarətdə, ticdrət mevke'lərinin 60 prosentini tabakçь və bydkaçьlar təşqil etdiqini və şəbəqənin artmasь başlьca bynlarьn hesabuna oldygyny nəzərə alar isəq, o zaman ələqənin daxili bazarьnda xusysi ticarətin korkyly syrətdə artmasьndan bəhs etməqə jer olmadьgь tamamilə ajdьnlaşar.

Xusysi ticarətdə bir çok jeni muəssəsələrin törəməsi, xusysi sqş ətin əmtiə tədavulunun artmasьnь tə'min etməq idi. Ancak umymi əmtiə tədavulu barəsində rəkəmlər byny qəstərməjir, tərsinə xusysi muəssəsələrin ticarət tədavulu qet-qedə azalьr, və şəbəqənin artmasь tədavulun artmasьnь ətub qeçir. O halda xusysi ticarət sektorynda tədavul duşur. Xusysi bazarьn muaməlləsini tənzim edən kərarlarьn hejata qeçirilməsini kontrol etməqi asanlaşdьrmak uçun, hali-hazьrda Baqьda 7 ticarət komitəsi və 7 bazar komitəsi vardyr. Byndan başka Qəncə, Şəqi, Lənqəran, Karjaqin, Zakatala, Agdam və Stepanaqərtdə də, bazar komitələri vardyr.

### 6. 1926-27-ci ildə qənt təsərrufat məhsylatьnьn plan uzrə tədaruq edilməsi.

Qəntlilərin maddi cihətdən vəzijjətlərinin jaxşьlaşmasь və həmçinin daxili ticarətin artmasь muhum dərəcədə, qənt təsərrufat məhsylatьnьn inqişafьndan, by məhsylatьn əmtiə hissəsinin (satьşa çьkarьlan hissəsinin) artmasьndan və bynyn jaxşь kijmətlə satьlmasьndan asьlьdyr. Plan uzrə tədaruq edənlər (devlət təşqilatlarь və kooperasija) hansь əmtiəni tədaruq edirlər?

Pambyk, tutun, jyn, barama, çaxьr, spirt, arak və koz bijan qəqu, bagьrsak, kьl və gejri by qibi qənt təsərrufat məhsyllarьdyr. Azərbajcanda 64,000 ton xam pambyk satьn alьnmьşdyr, by mikdar Zakafkasija federasijasьnda tədaruq edilən butun pambygyn 84 prosentini təşqil edir. Pambyk uçun qəntlilərə 18,4 miljon manat verilmişdur.

Pambyk rajonlarьnьn lazьmi kədər manyfaktyr və taxьl ilə tə'min edilməməsi pambyk satьn alma işinin qedişinə pis tə'sir

etmişdur. Pambyk rajonyna qөndərilən bygda pis cins və çok zibilli olmagъna qөrə ja pambykçylar by bygdanь almadьlar, onlar xusysi bazardan pydy 6 manatdan bygda satъn almaga başladьlar. Halby qi, xam pambygyn pydyny 4 manat 70 kəpiqə satdьlar. By hal pambyk ilə bygda arasьndaqь ekvivalentliqi pozdy və pambygyn qəlirini azaltdь. Manyfaktyr bazarь da həmçinin qərqinliq qeçirdi.

Tutunə qəlincə, 251,5 min manat kijmətində 278,5 ton tutun tədaruq edildi. 600,1 min manatlьk 668,3 ton jyn hazьrlandь; jyn tədaruqu planь tamamilə həjata qeçirilmədi. Bynyn səbəbi bөjuq prosentin otyrak olmasь, xusysi tədaruqçulərin və başlьca kystarlarъn fə'alijjəti, və kojynçylarъn jaxşь kooperativləşdirilməməsidur. Barama 1.474,2 ton tədaruq edilmişdur qi, qeçən ilə nisbətlə by mikdar 178 prosent edir. 3 miljon manat kijmətində 15 miljon litr çъxъr tədaruq edildi. Spirt və arak 4.500.000 gradys hazъrlandь qi, bynyn kijməti 900.000 manat idi.

## 7. 1928-ci ilin 1 oktjabrъnda Azərbajcan və Baqьda bylynan ticarət muəssəsələrinin sijahъsь.

### I. Umym ittifak muəssəsələri.

#### A. SINDIKATLAR.

1. Umym Ittifak tokyma sindikatь;
2. " " qөn "
3. " " metal "
4. Qagъz sindikatь;
5. Devlət balьk sindikatь;
6. Mєşə sindikatь;
7. Maşъn sindikatь (maşъn satьşь);
8. Jag, pij sindikatь;
9. Neft sindikatь;
10. Silikat satьşь (şişə, şişə kablar, çini və porselan kablar satьşь);
11. Spiçka sindikatь;
12. Dyz sindikati;
13. Tutun sindikatь (qeçmьş Don devlət tutun fabriqi);
14. Qimija sindikatь;

#### B. TRESTLƏR

1. Devlət sənaje rənqli metallarь tresti;
2. Devlət tiqiş maşъnlarь tresti;
3. Devlət elektrotexniq tresti;
4. Moskva tiqiş tresti (hazьr paltar satьşь);
5. Leningrad tutun tresti;



6. Rezin tresti;
7. Kənd tresti;
8. Teze.

#### C. SƏHIMDARLAR ŞIRQƏTI.

1. Kaikas mineral sylarь şirqəti;
2. Devlət əcza ticarəti şirqəti;
3. Dagьstan ticarəti səhimdarlar şirqəti;
4. Metal skladь (dəmir, çygyn, polat və gejri satьşь);
5. Moskva ticarət şirqəti;
6. Mə'dən—metal ticarəti şirqəti;
7. Şimali Kaikasja ticarəti şirqəti;
8. Tokyma ticarəti şirqəti (topdan);
9. Tokyma ticarəti şirqəti (pəraqəndə);
10. Tokyma ticarəti şirqəti (qəndir tokymalar);
11. Turqmənistan ticarət şirqəti;
12. Taxьl ittifakь şirqəti;
13. Ət məhsylatь şirqəti;
14. Şərk səhimdarlar şirqəti;

#### Ç. GEJRI--DEYLƏT MUƏSSƏSƏLƏRI.

1. Baş pambyk komitəsi;
2. RSKŞC devlət ticarəti;
3. Ykrajna SŞC devlət ticarəti;

### II. Azərbajcan Sosjalist Şyra Cumhyrijjəti muəssəsələri.

#### TRESTLƏR.

1. Azərbajcan tokyma tresti;
2. " meşə "
3. " tutun "
4. " balьk "
5. " çaxьr "
6. " ipəq "
7. " mə'dən sənajei tresti;
8. Baqь qimija qөn "
6. Baqь məhrykat tresti;
10. Myxtar Daglьk Karabag çaxьr tresti;
11. Baqь inşaat tresti;
12. Baqь poligraı tresti;
13. Qənt təsərrufat məhsyllarьnь e'mal edən sənaje (kənnadijə, pijvə, papiros və sajir mə'mylat);
14. Azərbajcan devlət nəşrijjatь;
15. Azərbajcan devlət əcza ticarəti;

GEJRI–DEVLƏT MUƏSSƏSƏLƏRI.

1. Apteq idarəsi;
2. Azərbajcan pambyk muəssəsəsi;
3. „Кьzьl Oktjabr" inşaat fabriqi;
4. Azərbajcan neft ticarəti;

PAJÇЬLAR ŞIRQƏTLƏRI.

1. Azərticarət;

ICTIMAI TƏŞQILATLAR.

1. Hilali-əhmər;
2. Yşaklarь himajə komisjasь;
3. Dinamo (sport şejləri);
4. Azərbajcan həmqarlar ittifakь şyrasьnьn redaksija-nəşrijjat şe'bəsi;
5. Işsizlər kollektivi;

## III. Zakafkasija mikjasьnda əhəmijjətləri olan muəssəsələr.

TRESTLƏR.

1. Gurcustan Ali Xalk Təsərrufat Şyrasь trestlər kantory;
2. Gurcustan Xalk Toprak Komisarlьgьnьn xalk əmlaqь tresti;

SƏHIMDARLAR ŞIRQƏTI.

1. Zakafkasija avtomobil sənaje və ticarəti;
2. Zakafkasja devlət ticarəti;
3. Ermənistan devlət ticarəti;
4. Gurcustan devlət ticarəti;

ISTEHLAQ KOOPERATIVLƏRI.

1. Azərittifak;
2. Baqь Mərqəzi Işçi Kooperativi;
3. Kaspi nəklijjat istehlaq şirqəti (Kastipo);
4. Zakafkasija nəklijjat istehlaq şirqəti (Zaktpo);
5. Hər'i istehlaq şirqəti;
6. Vykosp lka (konserv təchizatь);
7. Mərqəzi ittifak, (Sentrosojyz);

QENT TƏSƏRSUFAT KOOPERASIJASЬ

1. Qəjbirliqi;



ISTSESALAT KOOPERATIVLƏRI.

1. Umym Gurcustan çaxьr ittifakь;
2. Gəncəçaxьr;
3. Konkordija;
4. Loza;
5. Tygittifak (Myxtar Daglьk Karabagda);

## 8. Əsas tədaruqçulər sijahьsь.

1. Zakafkasija pambyk komitəsi Azərbajcan şe'bəsi (xam pambyk);
2. Bijan səhimdarlar şirqəti (xam bijan qequ)—Ycar.
3. Zakafkasija xam mal şirqəti (bagьrsak, byjnyz, dьrnak, albymin—kan tequntulərinin işlənməsi və iləx...);
4. Umym Ittifak qen sindikatь (xam qen);
5. Karabag qənt kooperativi (tyt spirti, barama və iləx...) Stepanaqərt;
6. Karabag çaxьr kooperativi;
7. Konkordija (uzum, çaxьr, xam və saflaşdьrьlmьş spirt);
8. Gəncə çaxьr (uzum çaxьr, xam və saflaşdьrьlmьş spirt) Gəncə;
9. Lozo (uzum çaxьr, xam və saflaşdьrьlmьş spirt) Geqçaj.
10. Azvin (uzum, çaxьr, xam və saflaşdьrьlmьş spirt);
11. Kolokolo ( . . . . Şamaxь;),
12. Azəripəq;
13. Azərsənətbirliqi (xalça, sənaje kooperasijasь birləşməsi);
14. Bagçьlar ymydy (xam spirt) agdam
15. Zakatala tutunçulər şirqəti (japrak tutun);
16. Zakafkasija devlət ticarəti;
17. Azərittifak (bygda, arpa, çəltiq);
18. Qəjbirliqi (jyn, koz, pəndir, jymyrta, ot, barama, çəltiq, arpa;
19. Avçьlar—xəz kooperativi;
20. Qənaf səhimdarlar şirqəti (qənaf):

## 9. Azərbajcanьn plan uzrə idxalatь.

Azərbajcan jer əqinçiliq elqəsi olmasьna qerə, byranь ən lazьmlь olan əsas əmtiə ilə plan uzrə tə'min etməq çok əhəmijjətlidur. Jerli sənajein xusysi çəqisi nisbətən əhəmijjətsiz dərəcədədur. Bazara lazьm olan by əmtiə xaricdən qətirilir, qətirilər əmtiənin mustəhliqlər arasьnda təksimi daxili ticarət komisarlьgьnьn və onyn Azərbajcan muvəqqilinin ən muhum vəzifələrindən.

birini təşqil etməqdədur. Plan tərtib etməqin çətinliqi, əhalinin satьn alma kabilijjəti mikdarь hakkьnda bir dərəcəjə kədər duzqun mə'lymat olmamasьndadyr.

Həkikətdə Azərbajcana: 1925-26-ci ildə 46046,6 min manatlьk sənaje əmtiəsi, 11,464,0 min manatlьk taxьl 1626-27-ci ildə 58373,6 min manatlьk sənaje əmtiəsi, 10353,5 min manatlьk taxьl qətirilmişdur.

Sənaje əmtiəsindən pambyk, qatan, jyn və ipəq mə'mylatь, kənd, metal mə'mylatь, qөn əmtiəsi, çəqmə, silikatlar, inşaat meşə materiallarь kaloş, qagьz spiçka hejvan və bitqi jaglarь və gejri və byndan başka taxьl və jag qətirilməqdədur.

## II. Xarici ticarət.

### 10. Xarici ticarət məfhymy.

Xarici devlətlər ilə edilən ticarətə, jə'ni xaricdən əmtiə satьn alьb muəjjən өlqəjə qətirməqə və muəjjən өlqədən əmtiə qətirib xarici bir өlqədə satmaga, xarici ticarət dejilir. Xaricdən mal qətirməqə idxalat və ja import və xaricə mal qөndərməqə ixracat və ja eksport dejilir. Idxalat və ixracat məcmyyna xarici ticarətin umymi tədavulu dejilir. Idxalat və ixracat arasьndaqь nisbətə өlqənin ticarət balansь dejilir: Əqər idxalat kijmətcə ixracatdan artьk isə, өlqənin balansь passif, və əqər ixracata kijmətcə idxalatdan artьk olarsa, өlqənin balansь aktivdur dejilir.

### 11. Xarici ticarətin inhisarь.

Deməq olar qi, butun devlətlərdə (və qөhnə Rysjada), muəjjən qөmruq rysymyny verən hər bir şəxs və ja muəssəsə əmtiə idxal və ja ixrac etməqə ixtijarь vardyr. Şyralar Ittifakьnda isə hali-hazьrda xarici ticarətin devlət inhisarь dejilən ajrь bir kajda vardyr. By, idxalat və ixracatьn tamamilə hөqumətə ajid olmasь deməqdur. Şyralar Ittifakьnьn inhisara alьnmьş xarici ticarətini xalk ticarət komisarlьgь aparmakdadyr. Başka təşqilatlar və xusysi şəxslər ancak xusysi musaədə ilə əmtiə idxal və ja ixrac edə bilərlər. Xarici ticarət inhisarь, başka devlətlərin xalk təsərrufatilə əlakə sahəsində bizim xalk təsərrufatьmьzь plan uzrə aparmagь həjata qeçirməq deməqdur. By syrətlə, xarici ticarətimizin plan uzrə aparьlmasь, butun xalk təsərrufatьmьzьn plan uzrə aparьlmasь ilə sьkь syrətdə rabitəlidur. Byndan başka xarici ticarət inhisarь oldykda devlət idxalat ilə ixracat arasьndaqь nisbəti asanlьkla tənzim edə bilir, jə'ni ticarət balansьnь asanlьkla tənzim edə bilər qi, by, xusysilə malijjə təsərrufatьmьz uçun çok əhəmijjətlidur.



### 12. Xarici ticarətin Şyralar Ittifakь uçun əhəmijjəti.

Butun təsərrufat fa'alijjətinin əsasьnь xalk təsərrufatьnьn sənaje'ləşdirilməsi təşqil edən Şyralar Ittifakьnьn kyrylyşy işində xarici ticarətin nə kədər əhəmijjətli oldygy aşqardyr. Şyralar Ittifakь lazьm olan maşьn və təchizatьn çok hissəsini xaricdən tədaruq etməqə məcbyrdyr. By təchizatь tədaruq etməq işinin muvəffəkijjətli bir syrətdə qetməsi, başlьca idxal edilən əmtiənin qejfijjətindən, xam mallarьmьzьn satьş texnikasьnьn muqəmməlliqindən ixracatь tənzim etməqdən asьlьdyr. Idxalat uçun lazьm olan valjyta fondyny da ixracat əmələ qətirir.

### 13. Azərbajcanda gərb өlqələrinə ixracat.

Azərbajcanьn gərb өlqələrinə ixracatь aşagьdaqь rəkəmlər ilə ifadə olynyr:

Min manatlar ilə.

| Illər / Əmtiə | 1922—23-cu il | 1923—24-cu il | 1924—25-ci il | 1925—26-cь il | 1926—27-ci il |
|---|---|---|---|---|---|
| Neft məhsylatь . . | 8883,5 | 17610,9 | 34780,0 | 40039,4 | 58486,6 |
| Qənt təsərrufat məhsylatь . . . . . . | 2784,9 | 2298,5 | 3542,9 | 6635,9 | 3980,6 |
| Umymi ixracat | 11668,4 | 19859,4 | 38322,9 | 46675,3 | 62476,3 |

Azərbajcanьn gərb өlqələrinə olan ixracatьnьn artmasьnь qөstərən dijagram.




Şəqil-17.

By syrətlə Azərbajcanьn ixracatь, hər il artьr, 1923—24-cu ildən 1926—27-ci ilə kədər deməq olar qi, 6 dəfə artmьşdyr. Əsas ixracat əmtiəsi neft məhsylatьdyr qi, bynyn umymi ixracatdaqь xusysi çəqisi hər il artmakdadyr. 1923 34-cu ildə 70%-dən 1926—27-ci ildə 90%-ə kədər juqsəlmişdur: Neft məhsylatь Zakafkasija ixracatьnьn əsas əmtiəsi olyb Şyralar Ittifakьnьn da ən muhum ixracatьndandyr.

Qənt təsərrufat məhsylatьna qəlincə bynlarьn Azərbajcandan gərb elqələrinə olan ixracatь nisbətən azdyr, by ixracatьn mikdarь 1926—27-ci ildə 3980,6 min manata çatmьşdь. By məbləg əmtiə arasьnda by cur belunur.

| | | |
|---|---|---|
| 1. Meşə materjallarь | 110 | min manat |
| 2. Xəz | 100 | „ „ |
| 3. Balьk məhsylatь | 1129,8 | „ „ |
| 4. Kьl | 106,4 | „ „ |
| 5. Bagьrsak | 270,0 | „ „ |
| 6. Bijan qequ | 734,9 | „ „ |
| 7. Cecə, xalça, ipəq mə'mylatь | 1529,5 | „ „ |
| Cəmi | 3980,6 | min manat |

Qənt təsərrufat məhsylatьnь ixracat uçun əsas tədaruq edən Zakafkasija devlət ticarətidur. Ondan başka, Zakafkasija xam mal şirqəti, bijan səhimdarlar şirqəti və kooperasijadyr.

Ixracat əmtiəsinin istikaməti by curdur: Neft məhsylatь—Inqiltərə, Italja, Almapja və Frənsaja;

Meşə materjallarь, balьk məhsylatь—Şimali Amerika Muttəhid Ştatlarьna və Almanjaja;

Ipəq məhsylatь—Italjaja;

Bijan qequ—Şimali Amerika Muttəhid Ştatlarьna.

Neft məhsylatь hali-hazьrda dunja bazarьnda oldykca məhqəm bir vəzijjət dytmyş və by məhsylat Amerika trestləri olan Rojal, Detş-Şel və Inqiltərə, Holland və Inqiltərə-Iran qibi dunja mikjasьnda olan trestlər ilə belə rəkabət aparmakdadyr.

Qənt təsərrufat məhsylatьna qəlincə ony kejd etməlidur qi, kijməti əmələ qətirən amillərdən, dogrydan-dogryjə istehsalçьnьn aldьgь hissə o kədər agьr dejildur, laqin sonradan qet-qedə artan gejri xərclər agьrdyr. Byrada indijə kədər tənzim və həll edilməmiş, izafi xərclər məsələsi vardyr, bizim qənt təsərrufat əmtiəsi ixracatьmьzьn mukəddəratь isə by məsələnin duzqun kyrylyş və həllindən asьlьdyr, çunqu by izafi xərclər aradan qeturulməzsə biz dunja bazarьnda bejuq bir rəkabət apara bilməriq. Ajdьn şejdur qi, dunja bazarьnda qim, jaxşь cins əmtiəni ycyz satarsa o galib qələr. Byrada təbii olárak bir məsələ çьkьr: biz ixracat əmtiəmizi çokaltmalь, jaxşьlandьrmalьjьk. (By əmtiəni standartlaşdьrmalьjьk, jə'ni duzqun syrətdə sortlara ajьrmalь və baglamalьjьk) Bynynla barabar, biz xaricdəqi satьş aparatlarьmьzь (by aparatlarь elastiqləşdirməq və onlarьn kyrylyşlarьnь sadələşdirməq joly ilə) axşь'aşdьrmalьjьk.

Byndan başka, iqinci dərəcə ixracatьmьzь qucləndirməq uçun texniq tərtibat kyrmalьjьk. Çunqu əhəmijjətləri iqinci dərəcədə olan əmtiəmizin çok hissəsi, ancak by əmtiə bazarьn tələblərinə



qerə e'mal olyndygy zaman ixracat uçun əlverişli olar. By məksədlə, texnikanьn ən son tələblərinə yjgyn olarak, Qəncə bagьrsak zavody kyrylmyşdyr.

### 14. Gərb elqələrindən Azərbajcana qətirilən şejlər.

Hər şejdən əvvəl ony kejd etməlidur qi, gərb elqələrindən Azərbajcana qətirilən şejlər həmişə Azərbajcanьn ixracatьndan oldykca az olmyşdyr, jə'ni bizim gərb elqələri ilə olan ticarət balansьmьz həmişə aktiv olmyşdyr. Bizim idxalatьmьzь, başlьca, neft təsərrufatьna lazьm olan təchizat şejləri təşqil etmiş və by idxalat hər il çok artmьşdyr. Elə qi,

| | | |
|---|---|---|
| 1923—24-cu ildə | 297 | min manatlьk |
| 1924—25-ci „ | 5012 | „ „ |
| 1926—27-ci „ | 16547 | „ „ |

neft təchizatь idxal edilmişdur.

Azərbajcanьn neft sənajei uçun olan idxalat xusysi çəqisinin belə tez və çok artmasь, istehsalatь arasь qəsilmədən qenişləndirilən və kyrylyş texniq cihətdən jeniləşdirilib jakşьlaşdьrьlan, Azərneft işinin səmərələşdirilməsilə rabitəlidur.

Gərb elqələrindən Azərbajcana idxal edilən gejri əmtiə tamamilə əhəmijjətsizdur.

### 15. Şərk ilə olan ticarət.

Azərbajcan Avropanьn gərb elqələrindən başka, çok az mikdarda Turqijə ilə, və oldykca qeniş bir syrətdə Iran ilə də ticarət aparmakdadyr. Iran ilə olan ticarət ən çok tranzit karakterindəndur. Azərbajcan, istər Irandan Şyralar Ittifakьnьn Avropa hissəsinə və istər Şyralar Ittifakьndan Irana akmakda olan bejuq əmtiə selinin qeçid nuktəsidur.

Şyralar Ittifakьnьn Iran ilə olan ticarətini karakterize etməqdən etru, qeçən 1927—28-ci ildə olan əmtiə tədavulunu qeturəq.

**1927—28-ci ildə Şyralar Ittifakьndan Irana olan ixracat.**

| | | |
|---|---|---|
| **I gryp. Ərzak** | 23265 | min manat |
| Bynlardan: | | |
| Bygda yny | 1849 | „ „ |
| Kənd (pesok) | 2147 | „ „ |
| Kənd (rafinad) | 17711 | „ „ |
| **II gryp. Xam və jarь işlənmiş material** | 7691 | min m. |

| | | | |
|---|---|---|---|
| Bynlardan: | | | |
| Işlənmiş meşə materialь | 502 | min | m. |
| Kara metallar | 951 | " | " |
| Ag neft | 2217 | " | " |
| Benzin | 1724 | " | " |
| Sap | 724 | " | " |
| Barama toxymy | 100 | " | " |
| **III gryp. Mə'mylat** | 40508 | min | m. |
| Bynlardan: | | | |
| Çini və porselan mə'mylat | 727 | min | m. |
| Şişə mə'mylatь | 1529 | " | " |
| Dəmir və polat mə'mylatь | 989 | " | " |
| Rezin ajak kablarь | 1326 | " | " |
| Qisə | 869 | " | " |
| Pambyk toxymlarь | 29905 | " | " |
| Qətan tokymalar | 570 | " | " |
| Adi sabyn | 288 | " | " |
| Tyalet sabyny | 128 | " | " |
| Spiçka | 876 | " | " |
| Relslər | 129 | " | " |
| **IV gryp. Gejri əmtiə** | 6203 | min | m. |
| Cumlətanь | 71464 | " | " |

**1927—28-ci ildə Irandan Şyralar Ittifakьna qətirilən şejlər**

| | | | |
|---|---|---|---|
| **I gryp. Ərzak** | 29154 | min | m. |
| Bynlardan: | | | |
| Duju (hər bir cins) | 15362 | min | m. |
| Portakal | 880 | " | " |
| Kyry mejvələr | 8341 | " | " |
| Xyrma | 511 | " | " |
| Qurəqə | 998 | " | " |
| Badam və pustə | 2737 | " | " |
| Balьk və quru | 948 | " | " |
| **II gryp. Xam və jarь fabrikatlar** | 32856 | " | " |
| Bynlardan: | | | |
| Qən (işlənmiş) | 4497 | " | " |
| Qən (işlənməmiş) | 35 | " | " |
| Dəri (xəz) | 3051 | " | " |
| Kyzy dərisi | 1909 | " | " |
| Pambyk | 16751 | " | " |
| Həna | 246 | " | " |
| Jyn | 4394 | " | " |



| | | | |
|---|---|---|---|
| Cyt (hind qəndiri) | 509 | min | m. |
| Barama | 1275 | " | " |
| **III gryp. Gejri əmtiə (hejvani mə'mylat)** | 39 | min | manat. |
| Jəqyny | 62483 | " | " |

By ixracat və idxalat sijahьlarьnь mukajəsə edərəq, qerurуq qi, 1927—28-ci ildə bizim ticarət balansьmьz aktiv olmyşdyr.

Şyralar Ittifakьndan Irana qəndərilən başlьca əmtiə, hər bir cur (pambyk qatan və gejri) tokymalar, kənd, ag neft, benzin, şişə mə'mylat, spiçka və gejrilərіdur. Butun by əmtiə ən çok Şyralar Ittifakьnьn Avropa hissesindən qedir. Azərbajcandan isə Ag neft, bənzin, çimento və barama toxymy qəndərilir.

Irandan Şyralar Ittifakьna başlьca, duju, kyrydylmyş mejvə, pambyk, jyn, qən, badam və gejrіləri qətirilir. By əmtiədən Azərbajcanda kyry mejvə, duju, barama və portakal kalьr.

Umumijjətlə deməq olar qi, Şyralar Ittifakь Irana ən çok mə'mylat və jarь fabrikat xam mallar qəndərir və Irandan jejinti şejləri, xam mal alьr.

Butun by bəjuq əmtiə seli Şyralar Ittifakь ilə Iran arasьnda hərəqət edir, və by hərəqət zamanьnda Azərbajcan topragьndan qeçərqən əz qutləsinin (butun idxalat və ixracatьn) 6—7 fajizini Azərbajcanda byrakьr.

By əmtiə tədavulunun əsas jerləri (Turqəmənistan hudydyn-da) Xorasan, Baqь və Cylfadyr. Byndan başka hali-hazьrda Kara dəniz portlarь (Odessa) ilə cənybi Iran portlarь (Byşir) arasьnda dəniz ticarəti başlamьşdyr. Butun by əmtiə tədavulunun 60—70 fajizi Kaspi dənizi portlarьnda olmakda və by tədavulun mərqəzində Baqь porty bylynmakdadyr.

## 16. Baqь jarmarkasь.

Iqi tip jarmarka vardyr. Bynlardan biri, hər il qəntlərdə və ja qiçiq şəhərlərdə kyrylan bir çok xьrda qənt jarmarkalarьdyr. By jarmarkalarda qəntlilər əz məhsylatьnь satar və manyfaktyr qənt təsərrufat alətləri və gejri qibi sənajə mə'mylatь satьn alьr.

Iqinci tip jarmarkalar, bəjuq şəhərlərdə kyrylan topdan ticarət jarmarkalarьdyr. Baqь jarmarkasь da by tip jarmarkalardandyr. Baqь jarmarkasь hələ qi, cavan olmagьna bakmajarak jalьnьz daxili karakterdə dejil, çok da qiçiq dərəcədə olmajan bejnəlxalk karakterdədur. Baqь jarmarkasьnda bir tərəfdən Zakafkasija, Orta Asja, Ykrajna və Rysja Şyra Cumhyrijjətləri arasьnda, o biri tərəfdən Iran ilə Şyralar Ittifakь Cumhyrijjətləri arasьnda əmtiə tədavulu qedir. Az mikdarda da olsa Turqijənin də iştiraqь. Baqь jarmarkasь əmtiə tədavulnnun bejnəlxəlk karakterini artьrmakdadyr. Jarmarkanьn əmtiə tədavulunun ildən-ilə artmagьnь kejd etməlidur. By artma aşagьdaqь cədvəldən də qərunur:

| Illər. | Umymi tədavul (miljon manat ilə) |
|---|---|
| 1922 | 1,8 |
| 1923 | 4,7 |
| 1924 | 8,9 |
| 1925 | 16,1 |
| 1926 | 17,0 |
| 1927 | 31,0 |

Byndan başka, son illərdə daxili tədavulun azalması hesabьna, jarmarkanьn xarici ticarət karakterinin iqişaf prosesi qərulməqdədur. Xusysilə Iran ilə olan əmtiə tədavulu artmakdadyr. Iran tacirləri Baqь jarmarkasьnda pambyk tokymaları, kənd spiçka, metal mə'mylatь və gejri şejlər alьr və başlьca duqu, jyn, kyry mejvə satьrlar.

### B. KONTROL IŞI UÇUN MEVZY'LAR.

Aşagьdaqь məsələləri fiqirləşin və işi materialь uzrə təhlil edin.
1. Azərbajcanda mevcyd olan muvasələ jollarьnьn butun nev'lərini təsvir edin.
2. Azərbajcanьn daxili ticarətini karakterizə edin.
3. Azərbajcanьn xarici ticarət məsələsini təhlil edin.

### C. KONTROL SYALLARЬ.

Aşagьdaqь syallara jazь ilə cavab verin:

1. Şyra hequmətindən sonra Azərdajcan postasьnda nə qibi muvəffəkijjətlər əldə edilmişdur?
2. Azərbajcanьn dəmir jol mintəkəsinin yzynlyk və sьklьgьnь Şyralar Ittifakьnьnqь ilə dytyşdyryn.
3. Azərbajcanda hansь dəmir jollarьn çəqilisi təsəvvur edilməqdədur?
4. Azərbajcanьn şosa və toprak jollarьnь muxtəsər syrətdə karakterize edin.
5. Azərbajcanda avtomobil nəklijjatь nə haldadyr?
6. Kaspi ticarət flotynyn nə cur işlədiqini təhlil edin.
7. Şyralar Ittifakьnda daxili və xarici ticarəti hali-hazьrda nə cur təşqil edilmişdur?
8. Əmtiə mubadələsində, ictimaileşmiş sektormy joksa xusysi sektormy galib qəlməqdədur?
9. Topdan və pəraqəndə əmtiə mubadələsində başlьca iştiraq edənlər qimlərdur?
10. Qim plan uzrə qənt təsərrufat məhsylatь tədaruq edir və nə qibi əmtiə tədaruq edir?
11. Azərbajcana hansь əmtiə plan uzrə idxal edilir.
12. Şyralar Ittifakь uçun xarici ticartəin əhəmijjətini karakterizə edin.
13. Gərb əlqələrilə olan əmtiə tədavulumuz aktivmi joksa passivmidur?
14. Azərbajcan gərb əlqələirinə nə ixrac edir və oradan nə idxal edir?
15. Şərk ilə olan ticarətimizin nə halda oldygyny təsvir edin.

### Ç. GEJRI-MƏCBYRI ƏDƏBIJJAT:


1. Дубенский „Очерки по эконом. геогр. Закавказья“ изд. Закавказск. Краевого Комитета Р. К. П. ,Тифлис, 1924 г., стр. 48—71, 314—313.
2. Худадов „Закавказье“ изд. Центр. управления печати В. С. Н. Х. СССР за 1926 г. ,Москва, стр: 148--196.
3. Клупт „Закавказье„ изд. ГИЗ/а Р. С. Ф. С. Р. за 1927 г., Москва стр. 142—154.
4. Отчет Акционерного О-ва „Каспийское Параходство“ за 1927 г. изд. Баку.


---

*8-ci vəzifə:*

## RAJONLAŞDЬRMA.

**Vəzifənin mundərəcatь.**

Rajon mefhymy. Planlь təsərrufat ilə, elektiriqləşdirmə planь ilə, inzibatь reforma ilə rabitə. Şyralar Ittifakьnьn və Azərbajcanьn rajonlaşdьrьlmasь planь. Azərbajcanьn butun kezalarьnьn iktisadi karakteristikalarь.

## A. VƏZIFƏJƏ AJID IZAHAT.

### 1. Rajon məfhymy.

Gərbdən şərkə dogry 11000 qilometro və şimaldan cənybə dogry 4000 qilometro yzanan Şyralar Ittifakьnьn umymi teritorjasьnьn (ərazisinin) çok muxtəlif təbii-tarixi və iktisadi şərtləri vardyr. By muxtəlif təbii şərtlər, muxtəlif mintəkələrdə əməqin teritorjal bəlqusunə səbəb olmyş və byna nəklijjatьn inqişafь da qəməq etmişdur. Hər rajonyn əzunə məxsys karakteriq xasijjətləri vardyr. Məsələn Moskva civarьnda olan hissə, mərqəzi sənaje rajonydyr, Ykrajna cumhyrijjətinin şərk hissəsində bylynan rajon, cənybi mə'dən sənajei rajonydyr və ha belə əməqin by cur təksim olynmasь, ajrь-ajrь rajonlarьn və dolajisilə butun əlqənin iktisadi tərəkkisinə və istehsalat kuvvətinin inqişafьna jardьm etməqdədur.

Şyralar Ittifakьnьn rajonlaşdьrьlmasь məsələsi, hərbdən əvvəlqi zamanda muxtəlif mutəxəssislər uçun nəzəri tədkik mahijjətində bir məsələ olarak kalmьşdyr. Şyra hequməti isə by məsələni əməli sahəjə çьkarmьşdyr. Lenin joldaş rajonlaşdьrma məsələsinə çok əhəmijjət vermişdur.

### 2. Planlь təsərrufat ilə rabitə.

Rajonlaşdьrma məsələsi, planlь təsərrufat ilə rabitəlidur. Bejuq devlət teritorjasь içərisində ajrь-ajrь rajonlar, cografi əməq bəlqusu sajəsində xalk təsərrufatьnьn by və ja o sahəsində ixtisaslaşьrlar. Planlь təsərrufatьn vəzifəsi də inkilabdan əvvəl təbii

bir halda bylynan by cografi əməq bəlqusunu kət'iləşdirməq və səmərələşdirməqdur. Devlət tərqibindən rajonlarь ajьrd edib, təbii şərtlərə və cəmaətin tərqibinə qerə hər rajonyn xalk təsərrufatьndaqь rolyny qestərməqi bacarmak, əsas e'tibarь ilə təsərrufatьn həkiki planь deməqdur.

### 3. Elektiriqləşdirmə planь ilə rabitə.

Elektiriqləşdirmə fiqri dogrydan-dogryja, iktisadi rajonlaşdьrma fiqrini dogyrmyşdyr. Bir rajonda bejuq mərqəz stansjalarь kyrmak, by rajonyn təsərrufat xusysijjətləri ilə rabitəlidur. Onlarьn mevke'ləri, həcmləri və işlərinin istikamətləri byndan asьlьdyr.

### 4. Inzibati reforma ilə rabitə.

Ən nihajət, rajonlaşdьrmanьn əsas məksədi, Şyralar Ittifakьnь oldykca qehnəlmiş və təsadufi olan gybernja və kəza bəlquləri jerinə, daha əgьllь əsaslar uzərinə inzibati bəlqulərə ajьrmakdyr. Inzibati reformanьn əsasь, kabakqь gybernja, kəza və volyst bəlqusu jerinə, jeni oblast-okryg və rajon volostlarьna bəlməqdur. Byndan başka oblast, bir neçə qehnə gybernjadan, okryg bir neçə kəzadan və rajon volosty isə, qehnə bir neçə volostdan təşqil olynyr. Inzibati vahidlərin by cur bejudulməsi, kyllykçylar ədədinin azalmasьna, idarə aparatьnьn ycyzlaşmasьna və devlət budcəsi vəsajitinin az xarc olynmasьna səbəb olyr.

### 5. Rajon nədur?

Rajon sezu altьnda, teritorjanьn başka hissələrindən ez təbii (iklim, toprak, bitqi aləmi və gejri) və təsərrufat şərtləri ilə seçilən teritorja hissəsi anlaşьlьr. By təbii və təsərrufat şərtlərinin hej'əti-umymijjəsi rajonlarьn ittifakьmьzьn xalk təsərrufatьndaqь xusysi vəzijjətlərini muəjjən edir.

### 6. Şyralar Ittifakьnьn rajonlaşdьrьlmasь planь.

Şyralar ittifakьmьzьn təsərrufat oblastlarьna bəluşdurulməsi planьnьn karasь hazьrdyr. Həjata qeçirməq uçun əsas olmak uzrə devlət plan idarəsinin lajihəsi (prozesi) kəbyl olynmyşdyr. By plan ali devlət idarələri tərəfindən təsdik edilmişdur. By plana qerə Şyralar Ittifakьnьn Avropa hissəsi 12 oblasta, Asja hissəsi isə 9 oblasta bəlunəcəqdur. Teritorjanьn çok hissəsi rajonlaşdьrьlmьşdyr. Rajonlaşdьrьlan hissələr bynlardyr: Yral, Şimali kafkas, Ykrajna və gejriləri



Azərbajcanьn rajonlaşdьrьlmasьna qəlincə by məsələ butun Zakafkasija fedarasjasьnьn rajonlaşdьrьlmasь ilə rabitəlidur. Hali-hazьrda Azərbajcan Mərqəzi Icraijjə Komitəsi nəzdindəqi rajonlaşdьrma komisjasь tərəfindən by məsələ tədkik edilməqdədur.

### 7. Azərbajcan Sosjalist Şyra Cumhyrijjətinin rajonlaşdьrьlmasь planь.

Azərbajcan hal-hazьrda 15 kəza və 105 dairədən təşqil olynmyşdyr. Dajirə, dogrydan-dogryja qənt Şyrasь uzərində bylynan inzibatь vahiddur. Rajonlaşdьrma komisjasь daha quclu aşagь idarə inzibat-təsərrufat təşqilatlarь jaratmak uçun dajirələr mikdarьnьn azaldьlmasь lazьm oldygy fiqrinə qəlmişdur. Çok ola bilsin qi, cumhyrijjətimiz daxilində dajirələr ədədi 105-dən 75-ə kədər azaldьlacakdyr.

Dajirələr reformasьnьn məntiki nəticəsi olarak, dajirədən sonra iqinci inzibati vahid olan kəzalar nə cur olmalьdyr? məsələsi çьkacakdyr.

Bizim kəzalarьmьz teritorja, nufysy və iktisadijjat nekteji-nəzərindən nədən ibarətdur? Hər şejdən əvvəl ony kejd etməlidur qi Şyralar Ittifakьnьn başka hissələrindəqi kəzalara nisbətlə Azərbajcan kəzalarьnьn sahələri və nufyslarь azdyr. Ona qerə də Azərbajcan da kəzalarьn ədədi çokdyr. Azərbajcan kəzalarьnьn çok olmasьnьn bir neçə səbəbi vardyr qi, bynlardan birincisi, elqənin tarixi qeçmişidur.

Idarə sistemlərində bir sьra dejişiqliqlər olmagьna bakmajarak bir çok kəzalar indijə kədər qeçmiş Baqь, Kyba, Talьş, Şəqi, Qəncə və Zakatala xanlьklarь zamanьndaqь şəqillərini muhafəzə etməqdədurlər. Sonra cumhyrijjət teritorjasьnьn hissələrini ajьran təbii hudydlar (sьra daglarь, çellər çajlar) vardyr. Məsələn Kyba kəzasь, Şamaxь və Qejçaj kəzalarьndan başlьca Kafkas sьra daglarь ilə ajrьlmьşdyr. Lənqəran kəzasь şərkdən kaspi dənizi ilə hudydlanmьş olyb Iran topragьna sokylmyşdyr və Azərbajcanьn kalan hissəsindən, şimal tərəfdən jalьnьz Mygan çelu rajonynda ajrьlьr. Və ən nihajət Myxtarijjətli daglьk Karabag elqəsi və Nəxçivan Sosjalist Şyra Cumhyrijjəti kanyn əsasijə qerə ajrьlmьşlardyr. Hal-hazьrda dəjişmiş olan devlət kyrylyşy və jaşajьşьna qerə sez jok qi, tarixi əsaslar ilə hesablaşmaga jer jokdyr. Iktisadi xusysijjətlərə qəlincə, by xusysijjətlər əvvəllərdə teritorjanь hissələrə bəluşdurəndə hesaba alьnmamьşdyr.

Hali-hazьrda Azərbajcanь rajonlaşdьrmak uçun uç varjant vardyr; by varjantlardan biri Tiflisdə tərtib edilmiş, iqisi isə rajonlaşdьrma komisjasь tərəfindən hazьrlanmьşdyr:

| 1 varjant (Tiflis varjantь) | 2 var. (Baqь varjantь). | 3 var. (Baqь varjantь). |
|---|---|---|
| 1. Baqь okrygy<br>2. Kyba—Şamaxь "<br>3. Zakatala "<br>4. Ƣəncə Kazak "<br>5. Mərqəz "<br>6. Səljan—Lənqəran "<br>7. Daglьk Karabag "<br>8. Nəxçivan S Ş C "<br>9. M. Daglьk Karabag ɵlqəsi | 1. Bɵjudulmuş Kyba kəzasь "<br>2. " Lənqəran "<br>3. " Səljan "<br>4. NəxçivanSŞC "<br>5. Şəqi—Zakatala kozasь "<br>6. Ƣəncə—Kazak "<br>7. Şamaxьnьn şərk hissəsilə birliqdə Baqь kəzasь<br>8. Şamaxьnьn gərb hissəsi ilə birliqdə Ƣɵjçaj kəzasь.<br>9. Daglьk Karabag " | 1. Bɵjudulmuş Kyba kəzasь<br>2. " Lənqəran "<br>3. " Səljan "<br>4. Nəxçivan Ş.Ş.C .<br>5. Şəqi—Zakatala "<br>6. Ƣəncə—Kazak "<br>7. Şamaxьnьn şərk hissəsi ilə bir jerdə Baqь kəzasь<br>8. Şəmaxьnьn şərk hissəsi ilə Ƣɵjçai kəzasь<br>9. Myxtar Karabag ɵlqəsi "<br>10. Cəbrajьl kəzasьnьn bir hissəsi ilə birliqdə Agdam kəzasь.<br>11. Qurdistan kəzasь |

Tiflis varjantь istehsalat xusysijjətlərinə ƣɵrə tərtib edilmiş isə də, əhəmjjətli nɵksanь vardyr. Məsələn Baş Kafkas sьra daglarь ilə bir-birindən ajrьlmьş olan Kyba və Şamaxь kəzalarь bir okrygda birləşdirilir. By iqi şəhər arasьnda jajda belə rabitə duzəltməq çətindur. Pajьz və kьşda isə Baqь uzərindən ƣetməq lazьmdyr. Məhəlli şərtlərə yjgyn olan lajihələr, rajonlaşdьrma komisjasь tərəfindən Baqьda tərtib edilmiş olan iqi lajihədur.

By iqi lajihə arasьnda çok umymi nɵktələr vardyr.

By lajihələrə ƣɵrə, Kyba, Lənqəran və Səljan kəzalarьnьn hudydlarь bir az dəjişdirilir. Şəqi kəzasь, Zakatala ilə birləşir; şərk hissəsi Baqьja və gərb hissəsi Ƣɵjçaja verilərəq Şamaxь kəzasь ortadan ƣɵturulur.

By planlardan biri Nəxçivan S. Ş. Cumhyrijjətinin və Myxtar Daglьk Karabag olqəsinin myxtarijjət hukyklarьna tokynmamak və hudydlarьnь dəjişdirməməqlə barabar Myxtar Dəglьk karabagь, Agdam, Cəbrajil və qurdustan kəzalarьndan təşqil olynacak Karabag okrygyna daxil etməƣi lajihəjə alьr.

Iqinci varjantьn birincidən təfavutu isə, by varjantdan Myxtarijjətli Daglьk Karabag ɵlqəsi ajrь olarak kalьr, Cəbrajil kəzasь Agdam ilə Qurdustan kəzalarь arasьnda bɵluşdurulur, Şəqi ilə Zakatala isə indiliq birləşdirilməjir.

Rajonlaşdьrma məsələsi jakьn ƣələcəqdə həjata qeçiriləcəqdur. Azərbajcanda hələ qi, qɵhnə kəzalar vardyr. Bizdə indi haman kəzalarьn iktisadi cegrafijasьnь təsvirə qeçəcəƣiq.



## 8. Lənqəran kəzasь.

Lənqəran kəzasь 17° 31′ ilə 18° 31′ şərk yzynlyklarь və 38° 24′ ilə 39° 27′ şimal eni arasьnda olyb səhəsi 5379,2 kvadrat qilometrodyr qi, Azərbajcanьn butun teritorjasьnьn 6,3%-ni təşqil edir. By kəza Şyralar Ittifakьnьn ən cənyb nɵktələrindən birində bylynmakdadyr. Şimal tərəfdən Bylgar çajь ilə Səljan kəzasьndan ajrьlmakda, şərk tərəfdən Kaspi dənizi sahili ilə cənyb və gərb tərəfdən devlət hudydi ilə Irandan ajrьlmakdadyr. Hudyd xətti ƣirintili—çьkьntьlьdyr. By xət cənyb tərəfdən dəniz kьragьnda bylynan Astara şəhərindən qeçər və Astara çajь bojy ilə Şindan kalasьna kədər (1715 metro) sonra şimali-gərbijə çevrilərəq, Talьş sьra daglarьndan dag daraklarь bojy ilə Kyladaşa kədər (2062 metro) yzanьr. Hudyd xətti byradan şimal şərkijə çevrilib və talьş bojy ilə *S* şəqlində kьvrьlьb Bylgar çajь bojy ilə ƣedir. Lənqəran kəzasь jer arizələri e'tibarь ilə iqi gejri musavi hissəjə bɵlunur: Kaspi sahili bɵjynca ƣedən aranlьk (duzluq) hissə, və Talьş sistemilə doldyrylmyş daglьk hissədur. Lənqəran aranlьgьnьn deməq olar qi, hamьsь Kara dəniz səvijjəsindən alçakdyr.

Astara ilə Lənqəran arasьnda aranlьgьn eni 5—10 qilometrodan artьk dejildur. Şimala dogry ƣetdiqcə enliləşir və Pirişibdə aranьn enliliƣi 25—30 qilometroja, Belasyvarda isə 80 qilometroja kədər çatьr.

Juqsəqliƣə ƣəlincə aranlьgьn cənyb hissəsi dəniz səvijjəsindən alçakdyr. (Lənqəran dəniz səvijjəsindən 22 metro, Astara isə 24 metro alçakdyr) Şimali-gərbi istikamətində bir az juqsələrəq Pirişibdə, dəniz səvijjəsindən 37 metro juqsəqliƣə çatьr.

Talьş daglarь Kaspijə paralel və eninə Sьra daglarь şəqlində yzanьr, by sьra daglarь çatlaklar və dərələr qəsir; talьşьn bir çok çajlarь və dag çajlarь by çatlak və dərələr rabitəsilə dənizə akьrlar.

Ən muhum çajlar: Lənqəran çajь, Viljəz çaj, Bylgar çajь və Astara çajьdyr. Butun sahil bojynca jajьlmьş olan şirin syly "myrdav" ƣɵlləri Lənqəran aranlьgь uçun çok karakteriqdur. Bynlardan bir paralarь oldykca bɵjuq bir hevz təşqil edirlər. Çoklarьndan isə başdan-başa kamьş bitmişdur.

Lənqəran kəzasьnьn butun şimal aranlьk hissəsi jarь səhra halьndadyr. Kəzanьn çok hissəsi isə, məsələn 1800 metro juqsəqliƣə kədər meşə bitƣiləri ilə kaplanmьşdyr. Aranlьkda və aşagь daglьk mintəkədə heç kьrьlmajan meşələr ɵzunə maxsys bir sybtropiq karakterdədurlər. Agaclarь başdan başa sarmaşьklar sarьmьşdyr.

Dag ətəƣi aranlьgь hissələrində təsaduf edilən bataklьklar qollar ilə ɵrtulmuşdur. Meşələrdə "dəmir agac", palьt, fistik, vələs, ɀgcəkajьn, ipəq akasjasь, şimşad agaclarьna təsaduf olynyr.

Bitqilərin jajьlmasь və onlarьn inqişaf dərəcələri dəniz rutybətinin by bitqilərə çata bilməsindən asьlьdyr. Təxminən 1800-2000 metro juqsəqliqdən sonra bitqilər kyrtarьb Alp sahəsi başlajьr. Sybalpiq sahə meşəsiz jerlərdə dag kyrak sevən bitqiləri mintəkəsinə kədər duşur. Alp və Sybalpiq otlarь az inqişaf etmişdur.

Topraklarda bitqilər də oldygy qibi kyrşaklar uzrə duzulur. Jykarь mintəkədə dag çəmən topragь, daha aşagьda meşə topragь mintəkəsi vardyr, konyr topraklara da təsaduf olynyr. Lənqəran aranь uçun ən karakteriq olan sarь toprak mintəkəsidur. Sarь toprak bɵjuq bir sahə dytmakdadyr: başlьca Lənqəran aranьndan başlajьb dənizdən e'tibarən jykarь dogry meşə mintəkəsinə kədər davam edir. Sarь toprak çok munbit olyb, kijmətli bitqilər ziraəti uçun istifadə olyna bilər.

Lənqəran kəzasьnьn iklimi rutybətli, istidur. Illiq orta temperatyr 15° olyb, ilin 4 ajь isti qeçər. Jagmьr mikdarь e'tibarь ilə kəza iqi hissəjə ajrьlьr: 1) şimal hissəsidur qi, byrada bir ildə jagan jagmьr mikdarь 500 millimetrodan az, 500 millimetro və 700 millimetroja kədərdur; 2) cənyb hissəsidur qi byrada bir ildə jagan jagmьr mikdarь 700 millimetrodan 1300 millimetroja kədər və daha çokdyr. By iqi hissədə ilin mevsimlərinə qɵrə və veqetasja devrində jagmьr mikdarь by cur dəjişilir.

**BIR ILDƏ JAGAN JAGMЬR MIKDARЬ**

(Millimetro hesabь ilə)

| | Kьşda | jazda | jajda | pajьzda | kьş veqetasja devri. | jaj veqetasja devri |
|---|---|---|---|---|---|---|
| Kezanьn şimal hissəsində . . . . | 147 | 150 | 55 | 287 | 612 | 193 |
| Kəzanьn cenyb hissəsində . . . . | 286 | 208 | 125 | 643 | 1168 | 432 |

Umymijjətlə kəzanьn hər iqi hissəsində kьş devrində jagmьr oldykca boldyr. Byrada xusysilə cənyb hissədə jagmьr artьklьgь ilə mubarəzə etməq belə lazьm qəlir: tarlalara sy dolarak toprak çok rutybətlənir. Apreldən sentijabra kədər jaj veqetasja devrinə qəlincə, jagmьr mikdarь umymijjət e'tibarь ilə qafi qibidur, laqin by jagmьr çok səmərəsizdur· jagmьryn çok hissəsi sentijabrda jagьr qi, by zamanda artьk jajьlьk bitqilərin syja ehtijacьnь qeçmiş olyr. Və ja da apreldə jagьr qi, by zamanda jagmьr tarla, bag, bostan işlərinə mane olyr. Majdan e'tibarən kyraklьk başlajьr, və ajrь-ajrь illərdə də 2—3 aj davam edir.



Lənqəran kəzasь zənqinliqi e'tibarь ilə, jalьnьz Azərbajcanda dejil, hətta butun Şyralar Ittifakьnda ən az tapьlan jerlərdən biridur. Sahil zolagьnda həmişə jaşьl bitqiləri olan sybtropiq iklim, daglarda balta qɵrməmiş meşələr, butun bynlar, ɵz əhəmijjətləri e'tibarь ilə Azərbajcan hudydyndan xaricə belə çьkan, çok qeniş və cur-bə-cur perspektiv təşqil edirlər. Byrada çaj qoly qanafqəndir, kayçyk, duju, uzum, propka agacь və gejri qibi çok kijmətli bitqilər jetişdirməq mumqundur. Ən kijmətli cins agaclar ilə doly olan zənqin meşələr hələ qi duzqun bir syrətdə işlənməmişdur.

Lənqəran kəzasьnьn hali-hazьrda əsas zənqinliqi meşə, balьk və dujudur.

Ən muhumm noksanlar: jolsyzlyk, toprak azlьgь, kьzdьrma, camaatin mədənijjətcə qeridə kalmasь və cəhalətidur. Byrada jolsyzlykdan olmazьn çətinliqlər çəqilir. Muvasələ jollarь olmadan heç bir sənətin inqişafь mumqun dejildur. By məsələdən məarif və sihhijjə işləri də zərər qɵrur. Çunqu belə jolsyz deməq olar qi, mədənijjət mərqəzləri ilə rabitəsi qəsilmiş bir jerə mutəxəssis işçilər qetməq istəmajirlər.

Lənqəran kəzasьnda, butun toprak sahəsi hali-hazьrda by cur təksim olynyr:

259635 heqtar—meşəliq olyb, byndan 149535 heqtarь təmiz meşədur.

18162 heqtar—çəltiqliq.

20208 heqtar—əqin bostan, binə.

95754 heqtar—əl—verişsiz topraklardyr.

Çəltiq sahəsi hərbdən əvvəlqi mikdarь qeçməqdədur. Xusysilə son ilə kədər Iran ilə ticarət mukavələnamasь olmadьgьna qɵrə artmьşdyr. Laqin sy ambarlarь haman zaman içərisində artmadьgьndan əqinin 20%-i tələf olyr. 1927-ci ildə Astara, Lənqəran və Iliç portyndan jalьnьz devlət muəssəsələri adьna 12424 ton duju nəkl edilmişdur. Aran talьşlarь uçun duju, butun təsərrufatьn əsasьdyr və byna təbii şərtlər çok qɵməq etməqdədur.

Lənqəran aranь deməq olar qi, ideal bir syrətdə duz bir səth təşqil edir. Təbii hevzlərdə (myrdav)larda çokly şirin sy ehtijatь vardyr. Byrada jagьş zamanlarьnda sylarь bol olan çajlarьn sahillərində, sy ehtijattьnь saklamak uçun, nisbətən ycyz sun'i sy ambarlarь kajrьlьr. Butun bynlar sarь toprakdan duju ziraəti uçun sun'i istifadəjə qɵməq edir. Byrada jetişən duju jaxşь cinsdəndur (aqulə dujusu).

Şavrov dejir qi: „agranomlar və xusysilə camaat arasьnda duju, ziraətinin çok zərərli oldygy və kьzdьrmaja səbəb oldygy barəsində bir kənaət vardyr. Dogrydan da duju əqilən rajonlarda ɵldurucu kьzdьrma vakelərinə dajir o kədər həkiki misallar qɵstərilir qi, camaatьn məhv oldygy qɵrulməqdədur„. Laqin dərd heç

də dujudə dejil, duju tarlalarьna təqulən sydadyr. by sylar bir jerə qetməjir tarlalarьn ətrafьnda akarak jeri batlak halьna salьr. „Jerin batlaklanmasьna və syjyn boş jerə işlənməsinə karşь tədbirlər qerulən və duju tarlalarьndaqь syjyn ijlənməsinə jol verilməjən jerlərdə camaatьn bədən saglьgьna pis tə'sir edən kьzdьrma xəstəliqinin inqişafь qerunməjir“ (Dmitrijevin 1917-ci ildə nəşr olynmyş „Rysjanьn iktisadi cografijasь„ adlь əsərindən qeturulmuşdur).

Duju uçun çok isti və yzyn veqetasja devri və xusysilə çok rutybət lazьmdyr. Ona qerə də duju ancak tarlalarь yzyn zaman sy altьnda bylyndyrmaga jol verən sun'i syvarma jerlərində jetişdirilə bilər. Çunqu duju, jetişmə duzunun çok hissəsini sy altьnda qeçirməlidur. Duju əqini umymijjətlə çok çətin bir əqindur. Sy duju tarlasьnь hər tərəfdə bir səvijjədə basmak uçun tarla zollara və zollar da ləqlərə bəlunur. Ləqlər qet-qedə alçalan pillələr halьnda duzəldilir. by syrətlə syjyn sərbəst syrətdə bir ləqdən o biri ləqə akmasь tə'min edilər. Əqindən kabak ləqlər palçьk halьna qəlincəjə kədər nəmişləndirilər, byndan sonra ləqə sy byrakьlьr, sy bir neçə qun ləqdə kalьr, sonra sьjьk palçьga duju əqilməqə başlanьr. Əqindən 3 qun sonra ləqlərə təzədən sy byrakьlьr. Umymijjətlə duju əqininin ən muhumm hissəsi duju tarlasьnь daima sy altьnda bylyndyrmakdyr. Jeddi qun syvarьlmajan duju əqinləri sararmaga başlajьr və 10-15 qun sonra tamamilə tələf olyr. Bir çok əməq sərfi lazьm qələn alag otlarьnь təmizləməq əməlijjatь da az əhəmijjətli və az çətin məsələ dejildur.

282310 heqtar jer dytan zənqin Lənqəran meşəsindən inkilab illərində 109000 heqtarь tələf olmyşdyr. Meşələrin tələf olmasьna, by meşələrə əz başlarьna qeçən qeçərilər səbəb olmyşdyr. Qeçərilər əqin jer əldə etməq uçun meşəni jandьrьrlar. Kara mallar cavan agaclarь tələf edirlər və gejri. Hali-hazьrda muharəbədən kabak işlənilən mikdarьn 25 prosenti ışlənməqdədur. Azərbajcan meşə trəsti, by bəjuq zənqinliqdən ancak axьr illərdə istifadə edir. Trest 400000 Fransьz boçka taxtasь istehsal edib xaricə və 200000 boçka taxtasь da Baqьja qendərir. Boçka taxtasь adьndan anlaşьldьgь uzrə, boçka kajьrmaga işlədilir. Azərbajcan meşə tresti tərəfindən meşələr lazьmi kədər səmərəli syrətdə işlənməjir: agacь dograjьb, boçka taxtasь əldə etdiqdən sonra kalan hissə tyllanьr. Odyn və agac qəmuru hazьrlamagь elə duzəltməli qi, meşə luzymsyz jerə tələf edilməsin və qəsilən agaclar boş jerə oldygy jerdə çurujub tələf olmasьn. Meşələri duzqun syrətdə işlətməqə başlьca mane jolsyzlykdyr. Jol qeçən jerlərdə meşələr tələf edilmiş və ancak jol qeçməjən və qeçilməsi mumqun olmajan jerlər dəqi meşələr saglam kalmьşdyr. Jerli cinsləri əjrənməq və çьplaklaşmьş jerlərdə duzqun meşə təsərrufatь aparmak uçun meşə təcrubə stansjasь duzəltməlidur.



Lənqəran kəzasьnьn bəjuq zənqinliqlərindən biri də balьkçьlьkdyr. Balьk vətəqələri butun Kaspi sahili bojynca və Sara adasьna jajьlmьşdyr. Inkilab qunlərində vətəqələr məhv olmyşdyr. Indi by vətəqələr canlanmakda və bərpa edilməqdədur. Kymbaşь vətəqəsi isə,indi hərbdən əvvəlqindən çok, (58-6 0 ton) məhsyl verməqdədur.

Maldarlьk mə'lym oldygy uzrə, son illədə xalk Toprak Komisarlьgь tərəfindən tədkik edilmişdur. Maldarlьk jerli qəntlilərin jaşajьşlarьnda bəjuq rol ojnamakdadyr. Laqin kara mal, Irandan qeçən tayn korkysy altьnda bylynyr.

1926-cь ildə tayndan 32000 baş iri və xьrda kara mal tələf olmyşdy. Indiqi halda tayn jokdyr. Laqin taynyn başka jerdən qəlməsi korkysy həmişə vardyr.

Kəzadə 4 bajtar mintəkəsi 2 xəstəxana, 3 apteq və 5 məalicə mintəkəsi vardyr. Kəzada muharəbədən əvvəl cumlətanь 12 məqtəb var idi, bynlardan 8-i rys məqtəbi idi, musavat həqumətі zamanьnda 17 məqtəb var idi. indi isə 64 məqtəb vardyr, 5 məqtəb daha açьlmakdadyr və by jakьnlarda 5 dənə daha açьlmasь təsəvvur edilir.

Lənqəran şəhəri barəsində deməq lazьmdyr qi byrada ən naxoş məsələ, şəhərin porty olmamasь, juq və jolçylarьn qərəcilər vasitəsilə daşьnmasьdyr. Şəhər hər il Lənqəran çajьnьn daşmasь korkysy altьnda bylynyr.

Qeçən il Lənqəranda elektiriq stansijasь işə salьnmьşdyr, bir qərpiç zavody tiqilməqdədur. Bir konserv zavody işləməqdədur by zavob tomat hazьrlamak uçun pomidor şə'bəsi açmьşdyr. Lənqəran kəzasьnьn qeniş syrətdə inqişaf etmiş bostançьlьgь by zavod uçun bir istinaddyr. Bostanlar Lənqəran şəhəri rajonynda, təxminən 10-12 qilometrolyk bir radjysly sahə dytyr. By bostanlarьn umymi əqin sahəsi 1000 heqtar kədərdur. Bostanlar byrada dəmjədur. Nə akar və nə də çiləmə sy ilə syvarьlьr. By bostanlarda jetişən səbzəbatdan sənaje əhəmijjəti olanlar, xijar, pomidor, kartof, lobja, sogan və sarьmsakdyr. Bostançьlьk məhsylatь Baqь bazarьnda intensif olarak sərf ediləməqdədur.

## 9. Şəqi kəzasь.

Zənqin və tarixi bir kəza olan Şəqi-iklimi, topragьnьn cins və məhsylatьnьn karakteri e'tibarь ilə 4 rajona bəlunur. Birincis daglьk rajondyr. By rajon kəzanьn şimal hissəsini əhatə edib baş Kafkas daglarь hej'ətinə daxil olan dag silsiləsinin cənyb dəşunu təşqil edir. Şimalda Dagьstan cumhyrijjətinin Samyr okrygy ilə, gərbdə Zakatala kəzasь i ə şərkdə Qəjçaj çajь ilə hudydlanьr. By çaj Şəqi ilə Qəjçaj kəzasь arasьnda hudyd təşqil edər.

Iqincisi—aran rajonydyr. By aran Zakatala kəzasьnьn şərkindən, Qəjçaj kəzasьnьn hudydyna kədər bir çəqəq təşqil edib, başь Kafkas daglarь ətəqlərilə „Daş uz“ jajlasь arasьnda bylynyr və „Kara sy“ adь ilə məşhyrdyr.

Ev və təsərrufat tiqintilərinin çoky toprak və jarь toprakdan kajrьlmьş olyb, rutybətlidur qi, by da kəza camaatinin başdan başa məfsəl romatizmanь dytylmyş olmasьna səbəbdur. Jajlaklarda qeçə alaçьklarda jaşajьrlar.

Camaatьn başlьca məşgylijjəti maldarlьk, iqinci dərəcədə əqinçiliq və cənyb hissələrdə isə bagçьlьkdyr.

Kara mallardan ən çok jajьlanlarь iri byjnyzly mal, kojyn, qeçi, sonra eşşəq və at və, az mikdarda qəl və katьrdyr. Biçəneqlərin azlьgь sərt və yzyn çeqən kьş mevsimlərində jem tədariqinin mumqun olmamasь, Azərbajcanda kьşlaklarьn olmamasь və taynyn jajьlmьş olmasь, maldralьgьn inqişafьna mane olyr. B a ş l ь c a  g ь d a  m a d d ə l ə r i  s u t  məhsylatьdyr.

## 14. Cəbrail kəzasь.

Cebrajьl kəzasь Karabag sьra daglarь kollarь uzərində olyb, şimal tərəfdən daglьk Karabag, cənyb və cənyb şərki tərəfdən Aras çajь, gərb tərəfdən Ermənistan və Qurdustan şimal şərk tərəfdən Şəljan və Agdam kəzalarь ilə hudydlanmьşdyr. Kəzanьn sahəsi 4270 kvadrat qilometrodyr. 1926-cь ilin nufys sijahisinə ƣərə kəzanьn umym camaatь 75147 nəfər olyb, bynlardan 71995 nəfəri qəntdə, 3152 nəfəri şəhərdə jaşajьr. Kəzada nisbətən bəjuq olan bircə 3152 nufysly Karjagьn şəhəridur.

Kəzanьn umym əl verişli topraklarь 304 min heqtardyr. By toprak muxtəlif əqinlər arasьnda by cur təksim olynyr:

| | | | |
|---|---|---|---|
| Θruş və qollyk | 114 | min heqtar | |
| Otlak . . . . . | 75 | „ „ | (başlьca kьşa maxsys) |
| Əqin topragь . . | 74 | „ „ | (syvarьlan 42 min heqtar) |
| Meşə . . . . . | 38 | „ „ | |
| Kalanlar . . . | 3 | „ „ | (binələr, baglar, biçənəqlər) |

Şy barəsində Cəbrail kəzasь Karabag okrygyna daxildur. Kəzada bəjuq bircə Qəndələn çaj vardyr qi, qəntlilər tarlalarьn ьby çajьn syjy ilə syvarьrlar.

Kəzanьn mərqəzi olan Karjagьn rajonynda qəhrizlər vardyr qi, bynlarьn bir hissəsi tə'mir edilmişdur.

$19\frac{25}{26}$ -cь ildə 37 min heqtar əqin sahəsi by cur təksim olynmyşdyr.

| | | |
|---|---|---|
| Bygda . . . . . . . . . . | 17 | min heqtar |
| Arpa . . . . . . . . . . | 13 | „ „ |
| Pambьk . . . . . . . . . | 4 | „ „ |
| Çəltiq . . . . . . . . . . | 1,6 | „ „ |
| Darь, kargьdalь və bostanlar . . . | 1,4 | „ „ |



Kəzada qənt təsərrufat intensifliƣinin juqsəlişi əlaməti olarak ƣundən-ƣunə artan pambьk əqini ƣəstərilə bilər: 1925-ci ildə pambьk əqini 1000 heqtar idi, 1926-cь ildə isə 4000 heqtar olmyşdy.

Kəzada birinci jeri dytan maldarlьk axьrьncь illərdə hiss olynacak dərəcədə juqsəlmişdur.

Kojyn və qeçilər ilə tə'min olynmak barəsində Cəbrail kəzasь Azərbajcanьn başka kəzalarь arasьnda ƣərqəmli jer dytyr. 1926-cь ildə hər juz qəntlijə 1202 kojyn və qeçi duşurdu. Halby qi haman ildə Azərbajcanьn by hejvanlar ilə tə'min olynmaklьgь orta hesab ilə 824-baş idi.

Qənt təsərrufat məhsyllarь başlьca bazar ƣunlərində Karjagьnda satьlьr və byraja by məhsylat kəzanьn hər tərəfindən ƣətirilir.

## 15. Ƣəncə kəzasь.

Topografja şərtləri e'tibarь ilə kəzada çok muxtəlif mintəkələr vardyr qi, bynlar umymijjətlə aranlьk dag ətəƣi və daglьk olmak uzrə uç rajona bəlunur. Aranlьk hissənin topragь jaxşь olyb, lazьmi kədər syvarьldьkda çok məhsyl verə bilər, by hissədə başlьca turqlər jaşajьr. Dag ətəƣi hissəsinin topragь daha da jaxşь olyb, başlьca ermənilər (60%) və az mikdarda turqlər (27%) jaşamakdadyr. Daglьk hissədə jaşajan millətlərin arasьndaqь nisbət də by curdur.

Ƣəncə kəzasьnьn umym nufysy 204768 nəfər olyb, bynlardan 143190 nəfəri qəntdə və 61578 nəfəri isə şəhərlərdə jaşajьr. Ƣəncə şəhrində 55510 nəfər, Jelendorfda 3899 nəfər, Şamxorda 2119 nəfər jaşajьr.

Kəzanьn umymi sahəsi 5804 kvadrat qilometrodyr.

Kəzanьn əlverişli topraklarь 513 min heqtar olyb by cur təksim olynyr:

| | | | |
|---|---|---|---|
| Otlak . . . . . . . . . . | 243 | min heqtar | (kьşlьk ilə jajlьk arasьndaqь nisbət təxminən 2:1 dur) |
| Θruş və qollyk . . . . . | 68,5 | „ „ | |
| Biçənəq . . . . . . . . | 17,0 | „ „ | (syvarьlan ilə syvarьlmajan arasьndaqь nisbət 3 : 2 dur) |
| Meşə . . . . . . . . . . | 87,0 | „ „ | |
| Əqin . . . . . . . . . . | 90,0 | „ „ | (syvarьlan və syvarьlmajan deməq olar qi, musavidur) |
| Uzumluq və baglar . . . . | 4,0 | „ „ | |
| Maliqanələr . . . . . . . | 3,5 | „ „ | |

Syvarma mənbə'ləri başlьca: Ƶəjəm, Çəjir, Şəmqir, Kyşkar, Ƣəncə, Qurəq çajь, Ƣəran, Incə çajlarьdyr. Işləməjən jerli qəhrizlərin çok hissəsi hali-hazьrda bərpa edilmişdur. Ƣəncənin şimalьnda bylynan sysyz çəlləri syvarmak uçun bəjuq. Kara sakkal kanalь çəqilir. Əqin əahəsi çok artьr $19\frac{23}{24}$ -cu illərdə by sahə 54 min

heqtara musavi idi, $19\frac{25}{26}$-cь ildə isə 69,5 min heqtara çatmьşdyr.

69,5 min heqtar sahə by cur təksim olynyr:

| | |
|---|---|
| Bygda . . . . . . . . | 41 min heqtar. |
| Arpa . . . . . . . . | 18 „ „ |
| Pambьk . . . . . . . | 5,4 „ „ |
| Kartof . . . . . . . . | 2,8 „ „ |
| Əqilən otlar . . . . . . | 1,3 „ „ |
| Gejri bitqilər . . . . . | 0,5 „ „ |

Kəzada uzumçuluq qerqəmli uir jer dytyr. By barədə xusysilə alman kolonjalarь məşhyrdyr. 8 dənə həqumət çaxьr təsərrufatь vardyr. Azvin və Konkordjanьn 9 dənə arag və ispirt zavody işləjir.

Agroqultur və agropropaganda məsələsinə bəjuq dikkət verilmişdur. Bir neçə maşьn şirqəti və 40-50-jə kədər traktor vardyr. Kəzada 5 agranom və tyt şitilləri uçun calaklьgь olan 4 agranom mintəkəsi vardyr. Mərqəzi təcrubə seleqsja stansjasь, laboratorjasь və ipəqçiliq stansjasь, tayn aşьsь ə'mal edən, tayn ilə mubarəzə edici Zyrnabad stansjasь, qənt təsərrufatьna zərər verənlər ilə mubarəzə uçun entomolozi stansjasь, kyşçylyk stansjasь karakyl və merinos kojynlarьnьn dəlluqləri təşqil edilmişdur.

Qənt təsərrufat məhsylatьnь işlətməq uçun 3 pambьk təmizləjən zavod, 1 jag-sabyn zavody təşqil edilmişdur.

Jollar qafi dərəcədə jaxşь bir halda dejildur. Hali-hazьrda qənt jollarь tə'mir edilməqdədur.

Laqin Qjəncənin mə'dən və mə'dən zavod sənajeinin qələcəqi jaxşьdyr. Qjəncə kəzasьnьn mə'dən zənqinliqlərindən hali-hazьrda: 1) mis kalçadanь; 2) mis, 3) zəq və 4) əsas zənqinliq olan Daşqəsən magnisli dəmir daş jatagь tamamilə ajdьnlaşdьrьlmьşdyr. Azərbajcan Şyra həqumətı tərəfindən Kara-Sakkalda 43000 at kuvvətində, Azərbajcan hidrosentralь kyrmak karara alьnmьşdyr.

Junqul sənaje sahəsində Qjəncədə çok işlər qerulmuşdur. Qjəncə pambьk tokyma fabriqi indi sur'ətli bir syrətdə tiqilib bitirilməqdədur (birinci nevbədə), mahyt fabriqi isə artьk işə salьnmьşdyr.

### 16. Kazak kəzasь.

Kazak kəzasь, reljef, iklim, toprak və iktisadi xusysijjətlər e'tibarь ilə Qjəncə kəzasьna okşar. Oną qerə də Kazak kəzasь barəsində jalьnьz bir neçə səz səjləjəq.

Kazak kəzasьnьn nufysy 121016 nəfər olyb, bynlardan 114287 nəfəri qəntlərdə, 6729 nəfəri isə şəhərlərdə jaşajьr. Şəhərlərdə jaşajan camaatьn 2990 nəfəri kəzanьn mərqəzi olan Kazakda, 1581 nəfəri Akstafada 2158 nəfəri Taysdadyr.



Kəzanьn başlьca mənbe'ləri açьk kanallar və qəhrizlərdur. Açьk kanallarьn hamьsь syjy Akstafa və Həsənsy çajlarьndan Incə çaj və Tays çajьndan alьrlar. Byndan başka Xram çajьndan Şejxlinsqi syvarma kanalь çəqilmişdur.

Kazak qəntlilərinin həjatьnda əqinçiliqlə barabar maldarlьk da bəjuq rol ojnamьş və ojnamakdadyr. Maldarlьk xusysynda Kazak kəzasь Azərbajcanьn ən zənqin kəzalarьndan biridur.

Kəzada jajlьk otlaklar, deməq olar qi, heç jokdyr və kəzanьn butun kara mallarь Ermənistan jajlaklarьnda otarьlьr, byndan ətru orada 22 min heqtar sahə ajrьlmьşdyr.

Kəzada uzumçuluq başlьca Aleqsejevsqi, Granfeld, Traybengeld və Elizavet qəntləri rajonynda jajьlmьşdyr.

Kystar sənətlərindən byrada xusysilə xalçaçьlьk inqişaf edir.

### 17. Baqь kəzasь.

Baqь kəzasьnьn sahəsi 4631 kvadrat qilometrodyr.

Umym əlverişli topraklar 306 min heqtar olyb, by cur təksim olynyr.

| | | |
|---|---|---|
| Otlak . . . . . . . . . | 152 min heqtar | (çok hissəsi kьşlьk olyb jajlьk jalnьz 8,5 min heqtardyr) |
| Oruş və qollyk . . . . | 46 „ „ | |
| Əqin . . . . . . . . . | 78 „ „ | (jalnьz syvarьlmajan olyb syvarьlan ancak 3 min heqtardyr). |
| Meşələr . . . . . . . . | 25 „ „ | |
| Uzum baglarь . . . . . | 4 „ „ | |
| Gejriləri . . . . . . . . | 1 „ „ | |

Meşə ən çok kəzanьn şimal hissəsində, Xьzь və Altьagac cəvarьndadyr. 3 min heqtardan ibarət olan qiçiq syvarьlan sahə dəxi Xьzьda olyb byrada syvarma mənbe'ini balaca çajlar təşqil edir. $19\frac{25}{26}$-cь ildə butun əqin sahəsi 43 min heqtar idi qi, bynlardan 28 min heqtarьna bygda və 14 min heqtarьna arpa əqilmişdi.

Kəzanьn qənt təsərrufatь çok qeridədur. Byna səbəb toprak və iklim şərtlərinin əlverişli olmamasьdyr. Kəzanьn deməq olar qi, uçdə bir hissəsini Əfşaran jarьm adasь təşqil edir qi, by jarьm ada sysyzlyk, tropiq isti, sistematiq kyrak və daimi quləqlərdən zərər çəqir. Quləq əqinlərə zərər verir, baglarь, bostanlarь və az kala butun qəndi kym ilə doldyryr. Jagmьr mikdarь çok azdyr. By şərtlər içərisində taxьl əqini və maldarlьk heç inqişaf edə bilməmişdur.

By səbəblərə çok bəjuq istehlaq mərqəzinə (Baqьja) jakьn olmagьna qerə Əfşaran jarьm adasьnda həmişə bostançьlьk və uzumçuluqa mejl olmyşdyr. Ancak syvarьla bilən toprak sahəsinin azlьgь bostançьlьgь da 'dar bir çərçivə içərisinə salmьşdyr.

Uzumçuluqə qəlincə, by syvarьlmajan topraklar da, kymly dəniz sahili plazlarьnda nisbətdən bəjuq (4000 heqtarlьk) bir sahədə aparьlьr. Əqər uzum baglarь başdan-başa qəbələq və japrak buqən xəstəliqdən məhv olmasa idi, jxşь kazanc verərdi. By xəstəliqlə necə mubarəzə etməq lazьm qəldiqini cəmaət Şyra həqumәti zamanьna kədər kətijjən bilməjirdi. Byndan başka axьrьncь illərdə uzum tənəqini çiləməq və tozlamaga uzumu mьrdar edər (haramdyr) dejərəq camaat byna razь olmajьrdь. Bynyn nəticəsində məhsyl jaxşь olan illərdə belə bir heqtardan əldə edilən uzum 2500—3200 qilogramdan artьk olmamьşdyr.

Əfşaran jarьm adasь kyraklьga davam edən (incir, badam, pustə qibi) mejvələrə əlverişli olmagьna bakmajarak, byrada bostançьlьk çok zəif inqişaf etmişdur.

Kəzanьn daglьk hissəsi (Xьzь rajonynyn şimal hissəsi) isə, daha jaxşь təbii şərtlər içərisində bylynyr. Byrada jagmьr daha çokdyr. Toprak qilli və məhsyldardyr. Dag çeşmələri, bylytly jajlaklar və qeniş kьş otlaklarь əqinçiliq və maldarlьk uçun nisbətən daha əlverişli şərtlər əmələ qətirirlər.

Şyra həqumәti kyrylana kədər kəzada heç bir agranomiq jardьm jok idi hali-hazьrda 5 agranom və 4 agranom mintəkəsi vardyr. Kьşlak və jajlaklarь təksim barəsində bəjuq iş qərulmuşdur. By təksimatda ajrь-ajrь cəmijjət və təsərrufatçьlarьn ehtijaclarь nəzərə alьnmьşdyr. Kəzanьn qəntlilərini əqin materjallarь canlь və cansьz inventar ilə tə'min etməq, jeni qulturələr becərməq, jeni qənt təsərrufat usyllarь əjrənməq barəsində bəjuq jardьm qəstərilmişdur. By saatda Əfşəran jarьm adasьna meşə salmak, syvarmak (ən çok Xьzь rajonynda olmak uzrə) maldarlьgь jenidən təşqil etməq qibi, qənt təsərrufat sahəsində əsaslь işlərə hazьrlьk aparьlьr.

$19\frac{25}{26}$ ildə, hərəqət edən kymlardan 5,5 heqtarlьk bir hissəsinin hərəqətinin karşьsь alьnmьşdyr $19\frac{27}{28}$ ci ildə isə, 27 heqtarlьk bir sahənin kymlarьnь bərqitməq lajihəjə alьnmьşdyr. Xьzьnьn meşəliq jajlagьnda həm meşə, həm kym bərqidən və həm də mejvə agaclarь uçun calaklьk salьnmьşdyr. Mejvə calaklьgь əhalini aşьlanmьş mejvə agaclarь ilə tə'min etməq uçundur. Maldarlьgь juqsəltməq uçun biri Xьzьda o biri Noxanьda olmak uzrə 2 dənə maldarlьk istinad mintəkəsi təşqil edilir. By mintəkələrdə cins dəlluq hejvanlar jetişdirilir. Maştagadaqь kyşçylyk mintəkəsi də qenişləndirilir.

Baqь kəzasьnda zə'fəran jetişdirildiqini ajrьca kejd etməlidur. Hali-hazьrda by kijmətli (bitqi) Bilqəh, Maştagь, Binə, Şagan, Mərdəqan Nardaran qibi jalьnьz bir neçə qəntdə jetişdirilir. 1927-ci ildə zə'fəran əqilmiş sahə təxminən 87-88 heqtara çatmьşdь.



Axьrьncь olarak ony kejd edəq qi Baqь kəzasь Azərbajcanьn ən gələbəliq bir kəzasь olyb, 520.396 nufysy vardyr. Bynlardan 73564 nəfəri qəntdə 446832 nəfəri isə şəhərdə jaşajьr.

### 18. Səljan kəzasь.

Səljan kəzasь Azərbajcanda ən bəjuq bir kəza olyb 9555 kvadrat qilometro sahəsi vardyr. Kəza deməq olar qi, başdan-başa aranlьk olyb jalьnьz şimal tərəfdən qiçiq bir hissəsini Kəbristan təpəsi təşqil edir. Deməq olar qi, butun Mygan çəlu kəzanьn hej'ətinə daxil olyb, şimal tərəfdən Qur çajь, şərk tərəfdən Araz çajь, cənyb və cənyb şərk tərəfdən Bylgar çajь və Aqyşa ilə hudydlanmьşdyr. Byndan başka Səljan çəlu, də (Akyşa ilə Qurun əsas koly arasьndadyr) by kəzaja daxildur, Şirvan çəlunun cənyb şərk hissəsi Qur çajьnьn sol sahilindədur. Aras çajьnьn sol sahilində qeniş Mil çəlu vardyr qi bynyn da bəjuq bir hissəsi Səljan kəzasьna daxildur.

Toprak barəsində Səljan kəzasьnьn bəjuq hissəsi, Qur və Aras çajlarь çəquntulərindən ibarət olyb, bir neçə jerlərdə qeniş bataklar ilə qəsilmişdur. Myganьn cənyb tərəfinin bəjuq hissəsi Şoran və boz toprak ilə ərtulmuşdur. Kəzanьn ustun olan bitqi ərtuqu, bir çok jerlərdə şoranlar ilə ajrьlan jovşanlьk və şoranlь qilli jarь çəllər (kьrlar) dyr.

Kəzanьn iklimi isti, kyry və rutybəti az olyb byrada duzqun qənt təsərrufatь ancak sun'i syvarma şərtilə aparьla bilər.

Səljan kəzasьnьn jeqanə syvarma mənbe'ləri Qur, Aras və Bylgar az mikdarda çajlarь, və həmçinin jeni Aras çajьdyr.

Syvarma sylarь həm əz-əzunə akmak ilə və həm mexaniqi syrətdə verilir. Əz-əzunə akma vasitəsilə syvarma, kəzanьn syvarьlan ərazisinin hər tərəfində vardyr, mexaniqi syvarma isə bircə Qurdədur. Muhəndis sistemləri və jerli arxlar əz-əzunə akma vasitəsilə syvarma usylyna daxildur. Muhəndis inşaatьnьn çok əhəmijjəti olyb jerli arxlarьn rollarь çok azdyr.

Hali-hazьrda Myganda işləjən 3 muhəndis baş kanalь və bir tərq olynmyş boş kanal vardyr. Işləjənlər: Şaymjan kanalь, Lenin kanalь və Əzizbejov kanalьdyr. Tərq olynanь Myganьn ən bəjuq kanalь olyb orta Mygan kanalь adlanьr. Hər beş sy ambarьnьn (dərt kanal və jeni Arasьn) baş hissələrində dəhnə olyb, bynlar Arasdan alьnan syjyn mikdarьnь tənzim edərlər. Syjyn by cur tənzimi bəjuq daşgьn zamanlarьnda və həmçinin tə'mir və təmizləmə zamanlarьnda lazьm olyr. Kalan zamanlarda dəhnələrin açьk olmasьnьn heç bir korkysy jokdyr və sistemə qirən hər bir artьk syjyn jaxşьlьgьndan başka bir zərəri olmaz. Kanallarda syjyn olmasь, dogrydan-dogryja daşgьn devrinin başlamasьndan və daşgьnьn qucundən asьlьdyr. By hal Myganda

çala syvarmasь dejilən sistemi əmələ ƣətirmişdur qi, bynyn əsasь topragьn ajrь-ajrь hissələrini syja basmakdan ibarətdur. By sistem topraklarьn dyzlanmasьna və battaklanmasьna səbəb olmyşdyr. Mutəxəssislərin fiqirinə ƣərə tarlanь syja basmak jaxşь dejildur, tarlalarь xьrda şьrьmlar və kanallar ilə sylamalьdyr. Ancak başdan-başa və yzyn muddətli syvarmadan ehmallь və muntəzəm syvarma usylyna qeçməqlə, orta Asjada tarlalarьn dyzlanma korkysy qanar edilmişdur. Mygandan şoranlarь tamamilə qanar etməq isə syvarma sistemini dəjişdirib jenidən kyrmak ilə mumqun olyr. Aras və qur civari irazisində ɵz-ɵzunə akma usyly ilə sy çьkarьlmasь, mexaniqi usyl ilə əvəz edilir. Mexaniqi usyl iqi nev olyr: biri maşьn ilə o biri-çarx vasitəsilə syvarmadyr. Səljan kəzasьnda 1925-ci ildə cumlətanь 75 sy nasysy var idi.

Səljan çɵlu sy nasysy ilə ən çok tə'min olynan bir jerdur. Byrada sy nasyslarь Səljandan başlar, aşagь Xьllь qəndinə kədər davam edir 1925-ci ildə Myganda və Səljan çɵlundə mevcyd olan çarxlarьn ədədi 250-260 kədər idi.

Myganda və Səljan çɵlundə jerli, ɵz-ɵzunə akma arxlarьnьn roly bir o kədər bɵjuq dejildur. Bynynla barabar Qur civari qəntlilərin muhumm bir hissəsi və Aras həvalisi qutləsinin çoky jerli arxlardan (Kьzьl arx, Xaqi arxdan) istifa edirlər.

Mil çɵlundə hali-hazьrda Ƣavyr arx dejilən muhəndis kanalьnьn çəqilməsi uçur bɵjuq işlər aparьlmakdadyr.

Səljan kəzasьnьn camaatь, 1926-cь ilin nufys sijahisinə ƣɵrə 128.390 nəfərdur. Bynlardan 115275 nəfəri qəntdə və 13115 nəfəri şəhərdə jaşajьr. Şəhərdə jaşajanlardan 8252 nəfəri Səljanda, 1815 nəfəri Sabirabadda, 1889 nəfəri Hacь kabylda 1159 nəfəri Bank vətəƣəsindədur.

Səljan kəzasьnda əlverişli olmajan topraklar 33% kədərdur. By mikdar butun Azərbajcanda əlverişli olmajan topraklarьn orta normasьndan oldykca bɵjuqdur qi, by Səljan kəzasьnda kymyn, battagьn, şoran və ƣəllərin bollygy ilə izah olynyr. Əl-verişli topraklarьn umymi sahəsi 635 min heqtar olyb by cur təksim olynyr.

| | | | | |
|---|---|---|---|---|
| Ɵruş və qollyk | 285 | min | heqtar | |
| Otlak | 140 | „ | „ | (jəlьnьz kьşlьk) |
| Biçənəq | 29 | „ | „ | (syvarьlanьn syvarьlmajana nisbəti təxminən 2 : 1 dur). |
| Əqin | 174 | „ | „ | (syvarьlanьn syvarьlmajana nisbəti təxminən 2:1 dur) |
| Gejriləri | 7 | „ | „ | |

Qənt təsərrufat qulturəsi sahəsi $19\frac{25}{26}$ cь ildə 95 min heqtar olyb by cur təksim olynmyşdy:

| | | | |
|---|---|---|---|
| Bygda | 31,4% | Arpa | 40% |
| Çəltiq | 25% | Gejri qulturlər | 3,6% |



Ƣələcəqdə Səljan kəzasь ən artьk pambьkçьlьk kəzasь olmalьdyr, çunqu syvarma məsələsi inqişaf etdiƣi, Qur və Aras sylarьndan tamamilə və duzƣun syrətdə istifadə olyndygy halda pambьk əqininin ƣenişlənməsi uçun lazьm olan hər bir şərt vardyr.

## 19. Şamaxь kəzasь.

Şamaxь kəzasь Azərbajcanьn ən bɵjuq kəzalarьndan biri olyb, 7455 kvadrat qilometro sahəsi vardyr.

Əl verişli topraklar 527 qilometro olyb, by cur təksim olynyr:

| | | | |
|---|---|---|---|
| Ɵruş və qollyk | 309 | min | heqtar |
| Otlak | 69 | „ | „ |
| Biçənəq | 4 | „ | „ |
| Əqin | 117 | min | heqtar (syvarьlanьn syvarьlmajana nisbəti təxminən 3 : 1 dur). |
| Meşə | 24 | min | heqtar |
| Uzumluq | 2 dan bir az artьk | „ | „ |
| Gejri qulturlər | 2 | „ | „ əqsiq |

Butun əqin sahəsi $19\frac{25}{26}$ cь ildə 61 min heqtara çatmьş və by cur təksim olynmyşdy:

| | |
|---|---|
| Bygda | 71,5% |
| Arpa | 13,7% |
| Pambьk | 7% |
| Çəltiq | 0,1% |
| Gejri qulturlər | 7,7% |

Şamaxь kəzasь çok kədimdən bəri istehsalçь bir kəza olyb, ɵz məhsylynyn bɵjuq bir prosentini ixrac edərdi. Kəzanьn aran hissəsində, xusysilə Qur cəvari rajonynda pambьk quncut və çəltiq çok jaxşь jetişir. Kəzanьn aran mintəkəsinin muhumm bir hissəsini maldar qɵçərilər dytyr. Uzumçuluq və çaxьrcьlьk kəzanьn iktisadijjatьnda bɵjuq rol ojnajьr.

Mis mə'mylatь (Lahьc) ipəq tokyma (Basxal), ƣɵnçuluq, duluzçuluq qibi kystar sənətləri bərpa olmakdadyr.

Kəzada (neft, daş qɵmur mis mə'dəni qibi) təbii zənƣinliqlər boldyr.

Kəzada 3 agranom mintəkəsi açьlmьş və 3 agranom çalьşьr. Şamaxь şəhəri milli mubarəzələr zamanьnda tamamilə dagьlmьş idi, indi bərpa edilməqdədur. Məqtəb şəbəqəsi çok ƣenişləmişdur. 1926-cь ilin nufys sijahisinə ƣɵrə Şamaxь kəzasьnьn nufysy 91029 nəfər olyb hynlardan 83315 nəfəri qəntdə və 7614 nəfəri şəhərdə jaşajьr. Şəhərdə jaşajanlardan 3631 nəfəri Şamaxьda, 1616 nəfəri Qurdəmirdədur.

## 20. Agdam kəzasь.

Agdam kəzasь deməq olar qi, tamamilə aranlьk olyb, ən çok hissəsi qur çajьnьn sag sahilində bylynyr və qөhnə hudyd daxilində 4135,5 qilometrolyk bir sahə dytyr.

Kəzanьn əl-verişli topraklar sahəsi 326 min heqtar olyb, by cur təksim olynyr.

| | | | |
|---|---|---|---|
| Өruз | 120 | min heqtar. | |
| Otlak | 59 | " " | (jalьnьz kьşlьk) |
| Biçanəq | 14 | " " | (deməq olar qi, hamьsь syvarьlandyr). |
| Əqin | 118 | " " | (deməq olar qi, hamьsь syvarьlandyr). |
| Meşə | 5,5 | " " | |
| Baglar | 6,0 | " " | |
| Maliqanələr | 3,5 | " " | |

Syvarma mənbe'ləri Tərtərdən çəqilmiş kanallardan, qəhrizlərdən və Qur çajьnda kyrylmyş sy nasyslarьndan ibarətdur.

Kəzanьn, şaxtasьz ƣunləri çok, pajьzь kyry olan iklimi vardyr; illiq temperatyr 13°C—14,9°C ararьnda dəjişilir. Jagmьrlarь 240-400 millimetrodyr.

Kezanьn topragь juqsəq hissələrdə konyr, aşagь hissələrdə isə tund və açьk boz toprakdyr. Kəzanьn camaatь deməq olar qi, jalьnьz qənt təsərrufatь ilə məşgyldyr. $19\frac{25}{26}$ cь ildə 78 min heqtara çatan əqin sahəsi by cur təksim olynmyşdy:

| | |
|---|---|
| Bygda | 59,5% |
| Arpa | 15,7% |
| Pambьk | 23,1% |
| Çəltiq | 1,5% |
| Gejri qulturlər | 0,2% |

Kəzada maldarlьk oldykca çok inqişaf etmişdur. Hər cins kara maldan hər 100 qəndli təsərrufatьna butun Azərbajcanda orta hesab ilə 1306 baş duşduƣu halda, Agdam kəzasьnda 1663 baş, iri byjnyzly kara maldan butun Azərbajcanda orta hesab ilə 412 baş duşduƣu halda, byrada 638 baş; kojyndan butun Azərbajcanda orta hesab ilə 732 duşduƣu halda, byrada 924 baş duşur.

Kəzanьn umym nufysy 1926-cь ildə 124304 nəfər idi. Bynlardan 113791 nəfəri qəntdə, 10513 nəfəri şəhərdə jaşajьr. Şəhərdə jaşajanlardan 8153 nəfəri Agdamda, 1231 nəfəri Jevlaxda, 1127 nəfəri Tərtərdə çalьşьr.



## 21. Ƣөjçaj kəzasь.

Ƣөjçaj kəzasь qөhnə hudyd daxilində 5322 kvadrat qilometrodyr. Əlverişli topraklar 401 min heqtar olyb, by cur təksim olynyr.

| | | | |
|---|---|---|---|
| Өruş və qollyk | 147,0 | min heqtar | |
| Otlak | 87,0 | " " | (çoky kьşlьkdyr). |
| Meşə | 46,0 | " " | |
| Biçənəq | 14,0 | " " | (çoky syvarьlandyr). |
| Əqin | 98,0 | " " | (çoky syvarьlandyr). |
| Uzumluq | 4,5 | " " | |
| Bostan və maliqanələr | 4,5 | " " | |

Kəzanьn iklimi isti olyb illiq temperatyr 15°C və jagmьrlar 388-444 millimetrodyr. By rajonda çok battaklьklar (Ycar, Mususlu) vardyr. Syvarьlmajan əqinçiliq mumqun dejildur. Tarlalar, Alcьganças, Tyrjançaj, Ƣөjçaj, Dəvəbatançaj, Ƣirdimançaj, və Agsy qibi bir çok dag çajlarь və xьrda çajlar vasitəsilə və həmçinin az mikdarda Qur çajьnda kyrylmyş sy nasyslarь vasitəsilə syvarьlьr.

Əqin sahəsi $19\frac{25}{26}$ cь ildə 59 min heqtar olyb, by cur təksim olynyrdy.

| | |
|---|---|
| Bygda | 55,8% |
| Arpa | 20,7% |
| Pambьk | 21,1% |
| Çəltiq | 1,5% |
| Gejri qulturlər | 0,9% |

Kəzada uzumçuluq və ipəqçiliq oldykca inqişaf etmişdur. Hali-hazьrda 4 agranom mintəkəsi və 5 agranom çalьşьr. 1926-cь ilin nufys sijahisinə ƣөrə kazanьn nufysy 173667 nəfərə çatmьşdyr qi, bynlardan 162689 nəfəri qənt və 10973 nəfəri şəhərdə jaşajьr. Şəhərdə jaşajanlarьn 4539 nəfəri Agdaşda, 4281 nəfəri Ƣөjçajda, 1616 nəfəri Qurdəmirdə, 542 nəfəri Ləqidədur.

## 22. Zakatala kəzasь.

Zakatala kəzasьnda əlverişli topraklarьn nə cur təksim olyndygy qeçmiş vəzifələrdən birində ƣөstərilmişdi.

Umym əqin sahəsi 1925-26 cь ildə 72 min heqtara çatmьşdь qь, by mikdar 1923-24 cu ilə nisbətlə 100% artmьş və by cur teksim bөlunmuşdur.

| | |
|---|---|
| Bygda | 70,5% |
| Arpa | 9,5% |
| Çəltiq | 6,3% |
| Gejri qulturlər (kargьdalь, darь, tutun və iləx) | 13,7% |

Jerlər ən çok Qurmuq çajь, Talaçaj, Myxax çajь və sajir xьrda çajlar vasitəsilə syvarьlьr.

Iklim barəsində Zakatala kəzasь Pjemont və Lombardja (Italja) nьn ejni olan Kanьg (Alazan) ovasьnьn davamьdyr. Baş Kafkas sьra daglarьnьn jamaclarь bojynca Zakatala kəzasь 11° izoterm ilə, daxildə isə 12° və 13° ilə, hudydlanmьşdyr. Kafkas Sьra daglarьndan yzakda isti jaj, sərin pajьz, mө'tədil kьş olyr. Kar oldykca sьk-sьk jagьb 2-3 aj ərimәz. Jagmьrlarьn illiq orta mikdarь aranlarda 500-750 millimetro, Kafkas sьra daglarьnьn meşəli jamaclarьnda isə 750-1000 millimetrodyr. Şimal tərəfindən dag sьra daglarьnьn təşqil etdiqi mөhtəşəm divar ilə çevirilmiş olan Zakatala kəzasь sojyk quləqlərdən muhafəzə olynmyş və iklim şərtləri barəsində ən əl-verişli bir vəzijjətdə bylynmakdadyr. Ancak byrada da kyrak qeçən devr vardyr. Byna qөrə də jerli qəndli təsərrufatьnь syvarmak lazьm qəlir.

Byrada çəltiq əqilir, fьndьk jetişdirilir və bərəqətli jaj zamanьnda ipəqçiliq ilə də məşgyl olynyr.

$19\frac{25}{26}$ cь ildə tutun sahəsi 670 heqtara çatmьşdь.

Kəzada 5 agranom və 4 agranom mintəkəsi vardyr.

1926-cь ilin nufys sijahisinə qөrə Zakatala kəzasьnьn nufysy 80138 nəfərdur. Bynlardan 76769 nəfəri qəntdə və 3269 nəfəri şəhərdə jaşajьr. Kəzanьn mərqəzi və jeqanə camaatь çok olan şəhər 3269 nufysly Zakatala şəhəridur.

By vəzifəjə qөrə: Azərbajcan Sosjalist Şyra Cumhyrijjəti kəzalarьnьn iktisadi karakteristkasьna ajid bir kontrol işi jazьn.

---

*Metodiq karakterində kijmətli qөstərişlərindən өtru R. N. Şaxnazarova xusysən təşəqqur etməqi өzumə вorc вilirəm.*

**K. Gyzig.**

AZƏRNƏŞR mətвəəsində вasьldь

Baqь. Balşoj Marskoj və Krasno-Presnensqi quçələrin tinində № 16 36.

Baş Mətвyat Mudirliqi 2942 Sifariş 37 Sajь 6800